**AZƏRBAYCAN DİLİ və ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790-0738 (Print); ISSN 2791-0911 (Online)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

“Azərbaycan dili və ədəbiyyat tədrisi” humanitar elmlər istiqaməti üzrə dilçiliyin və ədəbiyyatşünaslığın bütün sahələrinə aid Azərbaycan, türk, ingilis və rus dillərində orijinal, yüksək keyfiyyətli elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatın (həmçinin xarici ədəbiyyatın) tədrisi metodikasını, onun tədqiqi və təbliği məsələlərini araşdıran resenziyalı, açıq girişli elmi-metodik jurnaldır. İl ərzində dörd dəfə nəşr olunur. Jurnal dilçilik məsələləri, metodika, qrammatika, dialektologiya, mətnşünaslıq, Azərbaycan ədəbiyyatı, türk dili və ədəbiyyatı, xarici ədəbiyyat, uşaq ədəbiyyatı və folklorşünaslıq mövzularını əhatə edən bölmələrindən ibarətdir. “Nəşrlər” bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır. Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.

---



**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790-0738 (Print); ISSN 2791-0911 (Online)

Approved by the Charter of the Ministry of Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

"Teaching of Azerbaijani language and literature" publishing original, high-quality scientific articles in Azerbaijani, Turkish, English and Russian languages in all fields of linguistics and literary (including foreign literature) criticism in the field of humanities is a peer-reviewed, Open Access scientific-methodical journal that studies the methodology, its research and promotion. Published four times a year. The journal consists of sections covering linguistics, methods, grammar, dialectology, textology, Azerbaijani literature,

Turkish language and literature, foreign literature, children's literature and folklore. In the section "Publications" are presented new books published in the scientific and pedagogical field. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.

---

# İÇİNDƏKİLƏR / № 1, 2023

## M E T O D İ K A



## D İ L Ç İ L İ K  M Ə S Ə L Ə L Ə R İ



## Q R A M M A T İ K A

## Ə H M Ə D   C A V A D



## Ə D Ə B İ   M Ü H İ T

## CONTENTS / № 1, 2023

### M E T H O D S



### L I N G U I S T I C   I S S U E S

## G R A M M A R



## A H M A D J A V A D



## L I T E R A R Y E N V I R O N M E N T

Education of children and young people in the spirit of national and moral values, which are an unparalleled source of wealth and power

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 12-22
doi.org/10.48445/c7624-9285-9383-t

**M E T O D İ K A**

# Ədəbiyyat dərslərində bədii əsərlərin təhlili və ifadəli oxusu üzrə bacarıqların əlaqələndirilməsinə dair

***Bilal Həsənli***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Əməkdar müəllim. Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**XÜLASƏ**
Təlim prosesində şagirdlərin bədii əsərlərin təhlili və ifadəli oxusu üzrə bacarıqlara yiyələnməsini təmin etmək ədəbiyyat müəlliminin mühüm vəzifələrindəndir. Ədəbiyyat dərslərində tədris olunan əsərlərin ideya-bədii xüsusiyyətlərinin dərindən mənimsənilməsinə nail olmadan ifadəli oxu üzrə iş təşkil etmək doğru olmaz. Bədii əsərləri təhlil etmək və ifadəli oxu bacarıqlarına nail olmaq şagirdlərin ədəbi inkişafında mühüm rol oynayır. Məqalədə ədəbiyyat dərslərində təlim materiallarının öyrədilməsi

**AÇAR SÖZLƏR**
ədəbiyyat dərsləri, şagird, bacarıq, ifadəli oxu, əsərin təhlili

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 12.01.2023
qəbul edilib: 19.03.2023

nümunəsində şagirdlərdə bədii əsərləri təhlil etmək və ifadəli oxu bacarıqlarının formalaşdırılması üzrə iş metodikası əsaslandırılmışdır.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 12-22
doi.org/10.48445/c7624-9285-9383-t

**METHODS**

# On the analysis and expressive reading of literary works in literature classes on the coordination of skills

***Bilal Hasanli***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Honored teacher. Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**ABSTRACT**
Implementation of the skills of analysis and expressive reading of works of art in the process of learning the important task of the teacher of literature. Without a deep understanding of students' ideological and artistic features of the studied

**KEYWORDS**
literature lessons, student, skill, expressive reading, analysis of the work

**ARTICLE HISTORY**
Received: 12.01.2023
Accepted: 19.03.2023

works is not possible organization of expressive reading in literature classes. Relationship skills analysis and expressive reading of works of art is of great importance in the literary development of pupils. In the article on the example of teaching materials grounded methodology of work for the implementation of communication skills analysis and expressive reading of students in literature.

## Giriş / Introduction

Şagirdlərdə ifadəli oxu bacarıqları bədii oxu sənətinin qanunları, bədii əsərin ideya-məzmununun və sənətkarlıq xüsusiyyətlərinin təhlili, səslənən təsirli sözlə yaradıcı şəkildə canlandırılması əsasında formalaşdırılır. İfadəli oxunun əsasında iki mühüm cəhət dayanır:

1. İfa edilən əsərin ideya-məzmununun dərindən qavranılması, təsvir olunanların mahiyyətinə nüfuz edilməsi;
2. Hiss edilənlərin, qavranılanların səslənən sözlə dinləyicilərə çatdırılması.

Metodik ədəbiyyatda ifadəli oxu bədii mətnin məzmununun mənimsənilməsi və təhlili ilə sıx əlaqədə götürülür. İfaçı öyrənilən əsərin ifadəli oxusuna hazırlaşarkən, ilk növbədə, mətnin məzmununu dərindən mənimsəməlidir. Sonrakı mərhələdə əsərin ideya-bədii, mövzu, janr baxımından təhlili aparılır. Bu zaman əsərin oxucuda yaratdığı təəssürat dərinləşir, onda mətni ucadan oxumaq arzusu oyanır. Əsərin səslənən sözlə ifadəsi ifaçıdan nəyi və hansı məqsədlə çatdıracağını, dinləyicidə hansı hiss və duyğular, fikir və düşüncələr oyadacağını, onda hansı qənaəti yaradacağını dəqiq müəyyənləşdirməyi tələb edir. Qarşıya qoyulan məqsəd əsasında konkret ifaçılıq vəzifələri dəqiqləşdirilir. İfaçı qarşıya qoyduğu məqsədə uyğun olaraq dinləyicilərə sözlə təsir etməyi bacarmalıdır.

Oxu sənətinin nəzəri əsaslarını işləyib hazırlamış böyük rus aktyoru, rejissor və pedaqoq K.S.Stanislavski səhnədə nitqi “həqiqi, yaradıcı və məqsədyönlü fəaliyyət” hesab edirdi. Onun fikrincə, dinləyiciyə sözlə təsir etmək üçün ifaçı əsərin ideya-məzmununu dərindən bilməli, orada öz əksini tapan hiss və düşüncələrin, münasibətlərin mahiyyətinə varmalıdır. Mətndə verilən mənanı, müəllif niyyətini başa düşən, oradakı emosional ovqatı hiss edən ifaçı əsərdə təsvir olunan səhnələr, həyat hadisələri haqqında dinləyicilərdə səslənən sözlə aydın təsəvvür yarada bilər.

**Mətnaltı məna.** Bədii əsərdə həyat hadisələrinin obyektiv

inikası ilə yanaşı, müəllifin təsvir edilənlərə, qəhrəmanlara subyektiv münasibəti, onları təsvir etməkdə məqsədi də öz əksini tapır. Əsərdə hadisəyə, qəhrəmanlara münasibət açıq şəkildə, çox vaxt ayrı-ayrı replika və detallar vasitəsilə oxuculara çatdırılır. Amerikalı yazıçı E.Heminquey bədii əsərin məzmununu yalnız səkkizdə biri suyun üzərində görünən aysberqə bənzədirdi. Onun fikrincə, suyun altında qalan əsas hissə isə "mətnaltı məna"dır və məhz bu hissə aysberqin hərəkətinin möhtəşəmliyini göstərir.

Deməli, mətnaltı məna əsərdə təsvir olunanların ilk baxışda aşkara çıxarılmayan məğzi, daxili mahiyyətidir. "İfadəli oxu o zaman vəzifəsini uğurlu yerinə yetirmiş hesab olunur ki, əsərin məzmununa ifaçının münasibəti və bu məzmuna verdiyi qiymətlə müəyyənləşən mətnaltı məna çatdırılır... Sətirlərin arxasındakı daxili mətləbin – mətnaltı mənanın aşkara çıxarılması asan deyil. Bu, oxucudan diqqətli olmağı, mətnə dərindən nüfuz etməyi tələb edir. Hər sözün, cümlənin üzərində düşünməklə, əsəri dərindən araşdırmaq və təhlil etməklə doğru nəticəyə gəlmək, yəni mətnaltı mənanı üzə çıxarmaq mümkündür" [5, s.70-71]. Mətnaltı məna müxtəlif ifaçılar tərəfindən fərqli müəyyənləşdirilə bilər. Bu zaman bütün ifaçılar əsərin daxili mənasından, mahiyyətindən çıxış edir, lakin hər bir oxucu mətnaltı mənanı müəllifin fikrini, niyyətini, obrazları necə başa düşməsindən asılı olaraq təyin edir.

Əsərdəki mətnaltı mənanı başa düşmək üçün bəzən sənətkarın tərcümeyi-halına, əsərin nə zaman və harada yazıldığına diqqət yetirilməlidir. Q.Zakirin ictimai məzmunlu şeirləri içərisində xüsusi yer tutan "Durnalar" qoşması Bakıda sürgündə olarkən yazılmışdır. Şair başına gələn hadisələrdən – üstünə şər atılıb sürgün olunmasından, oğlu Nəcəfqulu bəyin, qardaşı oğlu İsgəndər bəyin Rusiyanın içərilərinə sürgün edilməsindən açıq danışa bilmədiyi üçün işarə və eyhamlardan istifadə etmişdir. O, ürək yanğısı ilə durnalara müraciət edərək deyir ki, dəstələrini dağıdan olmasın deyə bu yerlərdən tez, səssiz-səmirsiz ötüb keçsinlər:

Laçın yatağıdır bizim məkanlar,
Yavaş-yavaş gedin, səsiniz anlar.

Qorxuram toxuna ötən zamanlar,
Sürbəniz dağılıb çaşa, durnalar!

Əslində bu bəndin mətnaltı mənası doğma el-obasından ayrı düşən şairin çar zülmünə qarşı etirazını ifadə edir. Şair, "Laçın yatağıdır bizim məkanlar" deyərkən – ölkədəki dərəbəyliyi, haqsızlığı, bu yerlərin fitnə-fəsad yuvası olmasını nəzərdə tutur. "Sürbəniz dağılıb çaşa, durnalar" misrasında isə şair özünün tutulub rüsvay olmasına, nəslinin dərbədər salınmasına, evinin dağıdılmasına işarə edir.

Ədəbiyyatşünas M.Təhmasib yazır ki, Aşıq Ələsgər öz əsərlərində məhəbbətini də, nifrətini də, qəzəbini də eyhamla deməyə çalışmış, bunu anlayanları isə ən yüksək mərifət sahibləri hesab etmişdir. Məsələn, aşıq "Müşgünaz" rədifli qoşmasını bu cür yekunlaşdırır:

Ötkün sözüm, kəskin baxtım olaydı,
Ağ otağım, zərrin taxtım olaydı,
Ələsgərəm, cavan vaxtım olaydı,
Qəddim əyib qəhrü-qəza, Müşgünaz!

Bəziləri iddia edirlər ki, Ələsgər bu qoşmanı yaşlı vaxtlarında yazmışdır. Guya qoşmanın son bəndi də bunun sübutudur. Bu belə ola da bilər, olmaya da. Əsl məsələ burasındadır ki, Ələsgər bir qədər intim hisslərinin ifadəsindən ibarət olan bu arzusunu açıq şəkildə deyil, eyhamla ifadə etmişdir ki, bu da onun bədii ifadə üsuludur.

...Aşıq başına gəlmiş ən ağır fəlakətlərin doğurduğu dərdi, kədəri də eyhamlarla ifadə edirdi. O, "Kəsildi" rədifli şeirində, "tülək-tərlan" adlandırdığı oğlu Bəşirin bilmədən xalası oğlunu öldürməsinə həsr etdiyi böyük bir qoşmada "ölüm" sözünü bir dəfə də olsun dilinə gətirməsə də, eyhamla danışır, bu da şeirə xüsusi sanbal verərək onun daha gözəl və təsirli olmasına səbəb olur:

Nagah badi-sərsər əsdi üzümə,
Ömür bostanımın tağı kəsildi.
Öz əlimdən xəta dəydi gözümə,
Bədəndən qolumun sağı kəsildi.

Müqərrərdi, qaçmaq olmaz ölümdən,
Fələyin qılıncı dəydi belimdən,
Bir tülək tərlanım getdi əlimdən,
Ürəyimin bəndi, bağı kəsildi [2, s.172].

Mətnaltı məna əsərin oxunuşu zamanı müəyyənləşdirilməli, ifadəli oxuda dinləyicilərə çatdırılması üçün fasilə, vurğu, intonasiyadan məqsədyönlü şəkildə istifadə olunmalıdır. İfaçı tərəfindən əvvəlcədən ciddi hazırlıq işləri və ifaçılıq təhlilləri aparılmadan bədii əsərlərin ifadəli oxusu mümkün deyildir. Əsərlərin mənimsənilməsi, dərk edilməsi və səslənən sözlə yaradıcı şəkildə ifadə edilməsi ifaçılıq təhlilinin və zəruri hazırlıq işlərinin qurulmasını tələb edir. İfaçılıq təhlili məqsədyönlü, yaradıcı prosesdir. Mətnin ifadəli oxusuna hazırlıq işləri bir neçə mərhələni əhatə edir:

1. Əsərin məzmununun mənimsənilməsi;
2. Əsərin ideya-bədii xüsusiyyətlərinin təhlili;
3. Xüsusi təhlil;
4. İfaçılıq vəzifəsinin müəyyənləşdirilməsi;
5. Nitq texnikası üzrə iş.

Bədii əsərin oxusu zamanı ifaçının hazırlıq səviyyəsi, əsərin mürəkkəbliyi və həcmindən asılı olaraq ifaçılıq təhlilinin bu və ya digər mərhələsi üzrə işə xüsusi diqqət yetirilməlidir. İfaçı məzmunu bütövlükdə qavrayıbsa, əsərin məktəb təhlili aparılmalı, ədəbiyyatşünaslıq materiallarından istifadə etməklə onun ideyası, orada qaldırılan mənəvi-estetik problemlər barədə dolğun bilik əldə edilməlidir. Əgər ifaçı sənətkarın şəxsiyyəti, yaradıcılığı haqqında məlumatlı olub, əsərin ideya-məzmunu və dil-üslub xüsusiyyətlərini mənimsəyibsə, o zaman oxunun əsas məqsədinin müəyyənləşdirilməsi ön plana çəkilməlidir. Yəni ifaçı həmin əsəri dinləyicilərə nə üçün oxuyacağını, mətnin hər hissəsinin ifaçılıq vəzifəsini müəyyən etməlidir.

Beləliklə, ifadəli oxunun əsasında ifaçının əsərlə bağlı hiss və düşüncələri, məqsədi dayanır. Başlıca ifadəlilik vasitəsi isə intonasiya baxımından düzgün səslənən nitqdir.

**Əsərin məzmununun mənimsənilməsi.** Əsərin məzmununun dərindən mənimsənilməsi ifaçılıq vəzifəsinin yerinə yetirilməsinin mühüm şərtidir. Belə ki, ifaçı əsəri, yaxud ondan bir hissəni oxuyarkən bu və ya digər hadisədən əvvəl və sonrakı epizodları, əsərdə öz əksini tapmış həyati situasiyaları aydın şəkildə təsəvvür etməlidir. Çünki sənətkar əsərdə onların hər birini bütün incəlikləri ilə təsvir edir. Əsərin ayrı-ayrı hissələri bir-biri ilə sıx əlaqəli olub, əsas ideyanın, müəllif niyyətinin açılmasına xidmət edir.

İrihəcmli əsərləri dərs prosesi zamanı bütövlükdə oxumaq qeyri-mümkün olduğu üçün əsərin ideya istiqamətini əks etdirən müəyyən hissələrin seçilib oxunması və şərh edilməsi məqsədəuyğundur. “Əsərin ideya, mövzu, məzmununun başa düşülməsi o halda mümkündür ki, şagirdlər müəyyən keyfiyyətlərə: təxəyyülə, assosiativ təfəkkürə, emosional-mənəvi təcrübəyə malik olsun” [5, s.136].

Bədii əsərin məzmununun mənimsədilməsi məqsədilə aşağıdakı iş növlərindən istifadə olunur:

♦ Əsərin oxunuşu. Ədəbiyyat dərslərində məzmunun mənimsənilməsində geniş tətbiq olunan müəllimin nümunəvi ifadəli oxusu, bədii söz ustasının ifasının dinlənilməsi, səsli oxu, səssiz oxu, fasilələrlə oxu, proqnozlaşdırılmış oxu müsbət nəticə verir.

♦ Şagirdlərin mətndəki tanış olmayan sözlərin mənasını dərsliyin sonunda verilmiş lüğətdən, eləcə də digər lüğət və sorğu kitablarından istifadə etməklə müstəqil aydınlaşdırmaları üçün tapşırıqlar verilir. Müəllim zəruri hallarda sözün mətn daxilində işlənmə məqamına görə mənasının şagirdlər tərəfindən düzgün müəyyənləşdirilməsinə istiqamət verə bilər.

♦ Süjetli bədii nümunələrin (əfsanə, nağıl, dastan, təmsil, hekayə, mənzum hekayə) hissələrə ayrılması, plan tərtibi, məzmununun müxtəlif formalarda nağıl edilməsi üçün tapşırıqlar əvvəlki illərə nisbətən həcmcə böyük əsərlər üzərində həyata keçirilir.

♦ Əsərin məzmununun öyrənilməsi məqsədilə plan tərtibi əsərdəki hadisə və əhvalatların, qəhrəmanın hiss və düşüncələrinin mənimsənilməsinə xidmət edir. Planı əsərin oxusu zamanı və oxudan sonra tərtib etmək mümkündür. Fasilələrlə oxu, proqnozlaşdırılmış oxu metodlarının tətbiq edildiyi dərslərdə əsərin hər

bitkin hissəsindən sonra fasilə etmək, hər hissəyə başlıq vermək daha məqsədəuyğundur. Bu zaman oxunmuş hissəyə başlıq seçilməsi onun məzmunu üzrə sual-cavabla birlikdə aparılır. Əsərin oxusundan əvvəl şagirdlərə diqqətli olmaları üçün plan tərtibi üzrə iş aparılacağı barədə xəbərdarlıq edilir. Müəllim hər hissənin oxusundan sonra ona necə başlıq verməyin məqsədəuyğun olduğunu soruşur. Əsərin bütünlüklə oxusundan sonra seçilmiş başlıqlar üzrə plan tərtib edilir.

Süjetli əsərin məzmununun nağıl edilməsi şagirdlərin mətni dərindən mənimsəmələri və şifahi nitqin inkişafı baxımından mühüm əhəmiyyət kəsb edir. Əsərin məzmununun nağıl edilməsi üzrə iş üç formada aparılır:

- Məzmunun yığcam nağıl edilməsi;
- Məzmunun geniş nağıl edilməsi;
- Məzmunun yaradıcı nağıl edilməsi.

Yığcam nağıletmə üçün hazırlıq işi əsərin süjet xəttindəki, ideyanın açılmasında mühüm rol oynayan səhnə və epizodlara diqqət yetirilməsini, təfərrüatlardan, ikinci dərəcəli məsələlərdən imtina edilməsini nəzərdə tutur. Odur ki, yığcam nağıletməyə hazırlıq zamanı əsərdəki əsas və ikinci dərəcəli hissələr əvvəlcədən müəyyənləşdirilməlidir. Nağıletmənin məzmununa yalnız əsas hadisələrin, obrazların daxil edilməsi nəticəsində şagird nitqi yığcamlıq, aydınlıq, fikri az sözlə çatdırmaq kimi keyfiyyətlər əxz edir. Geniş nağıletmə şagirdlərin müstəqilliyi, təxəyyülünün inkişafı baxımından faydalıdır. Bu zaman məktəblilər mətndən kənara çıxmır, əlavələrini onun məzmununa uyğunlaşdırırlar. Yaradıcı nağıletmə zamanı şagirdlər müəllifin əsərdə bir neçə cümlə ilə ifadə etdiyi fikri, hadisə, təbiət, əşya, portret təsvirini genişləndirir, əlavələr edirlər. Onlar hadisələrin gələcək inkişafını necə təsəvvür etdiklərindən, qəhrəmanların gələcək taleyi ilə bağlı fərziyyələrindən söz açır, əsərin sonluğunu dəyişdirirlər [4, s.7].

Məzmunun bütövlükdə qavranılması məqsədilə sənətkar haqqında, əsərin mövzusu və yazılma tarixi barədə giriş səciyyəli söhbətlərin aparılması faydalıdır. Təcrübə göstərir ki, əsərin tam

şəkildə mənimsənilməsi və dinləyicilərdə emosional ovqatın yaradılması üçün bədii söz ustalarının ifasında lent yazılarının dinlənilməsi müsbət nəticə verir.

**Əsərin ideya-bədii xüsusiyyətlərinin təhlili.** Sənətkarın dövrü, həyatı, dünyagörüşü, ictimai-siyasi və ədəbi mübarizədə mövqeyi haqqında ədəbiyyatşünaslıq materialları seçilərək təhlil süzgəcindən keçirilir. Məktəbdə bədii əsərin təhlili ədəbiyyat müəllimindən dərin ədəbiyyatşünaslıq biliyi, metodik ustalıq, yaradıcı fəaliyyət, zəngin təcrübə tələb edir. Ədəbiyyat müəllimi şagirdin – oxucunun psixologiyasını, qavrama imkanlarını, maraq və meyillərini bilməli, əsərin təhlili zamanı bunları nəzərə almalıdır. Şagirdin əsərə münasibətinin öyrənilməsi, təhlil zamanı qavramanın dərinləşdirilməsi ədəbiyyat təliminin əsasını təşkil edir.

Ədəbiyyat dərslərində ədəbiyyatşünaslıq təhlili bu elmin son nailiyyətlərindən istifadə ilə reallaşdırılır. Ədəbiyyatşünas alimlərin tədqiqatları əsərə sənətkarın yaradıcılığı, dünyagörüşünə tarixi dövr kontekstində nəzər salmağa, əsərin məzmununu düzgün başa düşməyə, qiymətləndirməyə imkan verir. Bu zaman bədii təsvir və ifadə vasitələrinin, sənətkarın fərdi yaradıcılıq üslubunun, obrazların dilinin təhlili aparılır.

Bu mərhələdə müxtəlif ədəbi növdə olan sadə və mürəkkəb kompozisiyalı əsərlərin ideyası, bədii xüsusiyyətləri, əsərdə əksini tapan başlıca problem, konflikt, mənəvi dəyərlər, obrazların xarakteri aydınlaşdırılır, dərk edilir və qiymətləndirilir. Təhlil prosesində müxtəlif tarixi dövrlərdə yaranan ədəbiyyatın səciyyəvi xüsusiyyətləri, yazıçının yaradıcı şəxsiyyəti, sənətindəki özünəməxsusluq üzə çıxır.

Elmi-metodik ədəbiyyatlarda bədii əsərin ifadəli oxusu və təhlilindən bəhs edilərkən məktəb təhlili ilə yanaşı, ədəbiyyatşünaslıq təhlili terminindən də istifadə olunur. Bu məsələ təlim prosesində müəyyən dolaşıqlıq yaratdığı üçün aydınlaşdırılmalıdır. Məktəb təhlili bir sıra xüsusiyyətlərinə görə ədəbiyyatşünaslıq təhlilindən fərqlənir. Belə ki, digər təhlil növlərindən – fəlsəfi təhlil, psixoloji təhlil, estetik təhlil, ədəbiyyatşünaslıq təhlili və s.-dən fərqli olaraq, məktəb təhlili

özündə bir sıra xüsusiyyətləri ehtiva edir. Onun əsasında, ilk növbədə, ədəbiyyatşünaslıq təhlili durur və yeri gəldikcə digər təhlil növlərinə də müraciət edilir. Məktəb təhlilində əsərin ideya-məzmunu, müəllif niyyəti, sənətkarlıq xüsusiyyətləri ön plana çəkilir. Odur ki, ədəbiyyat dərslərinə ədəbiyyatşünaslıq təhlilini olduğu kimi gətirmək olmaz. Ədəbiyyatşünaslıq təhlilini müəllifin fikirləri təhrif olunmadan məktəb təhlili materialına çevirmək lazımdır. Bu təhlildən istifadə zamanı ifaçının bilik, qavrama səviyyəsi, materialın həcmi və s. nəzərə alınmalıdır. Bədii əsərlərin məktəb təhlili özündə ədəbiyyatşünaslığın nailiyyətlərini ehtiva edir. Belə ki, o, pedaqoji prinsiplərdən, dövrün mənəvi ideallarını əks etdirən ictimai ideallardan asılıdır.

Məktəb təhlilini elmi-ədəbiyyatşünaslıq təhlilindən fərqləndirən ilk cəhət, bu təhlilin şagirdin qavrama xüsusiyyətlərini nəzərə almaqla həyata keçirilməsidir. Məktəb təhlilinin məqsədi bədii əsər haqqında şagird təsəvvürlərinin mətnin elmi şərhi ilə müqayisə olunması, oxucuların subyektiv təsəvvürlərinin ədəbiyyatşünaslıq təhlilinin nəticələri əsasında təshih olunması, obyektiv təsəvvürlərin yaradılmasıdır. “Əgər əsər təhlilinin digər növlərində əsas məqsəd bədii materialın özünü öyrənməkdirsə, məktəb təhlilində materialı öyrənən şəxs həm də yaradıcılıq fəaliyyətində olmaqla qavranılan materiala öz mənəviyyatından “əlavələr edir”. Məktəbdə ədəbi əsərin öyrənilməsi gənc oxucuda təkcə əsərin bədii mənasını açmağa meyil ilə, müəllifin ideyasına yiyələnməklə məhdudlaşmır, məktəb təhlilində şagirdin oxuculuq keyfiyyətinin inkişaf etdirilməsi vəzifəsi də – təxəyyülü, emosional həssaslığı, estetik qiymətləndirmə bacarığı, öz təəssüratını dərk etmək, onu intellektual və emosional ifadə etmək qabiliyyəti də həyata keçirilir” [7, s.161-162].

**Xüsusi təhlil.** İfaçının qarşısında olduqca mürəkkəb, çətin vəzifə dayanır. O, müəllifin yazdıqlarını səslənən sözlə dinləyiciyə çatdırmalı, bu zaman müəllif niyyətinin qavranılmasına, təsvir edilənlərə uyğun müvafiq ovqatın, emosional-obrazlı münasibətin yaradılmasına nail olmalıdır. İfaçı dinləyiciyə səslənən sözlə təsir

etmək üçün əsərdə təsvir edilənlərin mahiyyətini, mətnaltı mənanı dərindən qavramalı, müəllifin hiss və düşüncələrini özününküləşdirməli, hadisələri, qəhrəmanların həyəcanlarını, hərəkət, davranış motivlərini, düşdükləri vəziyyəti təxəyyülündə canlandırmalı, duyaraq yaşamağı bacarmalıdır. Bu iş xüsusi təhlil zamanı həyata keçirilir. Bu zaman ifaçı yazıçının düşüncə və hisslərinə, təsvir etdiyi həyata nüfuz edir, həyat hadisələrini, qəhrəmanların münasibətlərini, fakt və əhvalatları aydın şəkildə göz önündə canlandırır. O, əsərdə təsvir edilən hadisələri həyatla, öz şəxsi təcrübəsi ilə əlaqələndirərək aydın, dəqiq təsəvvürə malik olmalıdır. İfaçı özündə təsvir edilənlərə inam yaratmalı, özünü hadisələrin iştirakçısı, şahidi kimi təsəvvür etməli, müəllifin, qəhrəmanların hiss və duyğularına nüfuz etməyi bacarmalıdır. Əsərin hər hissəsi, hər epizodu müəllif niyyətinin açılmasına, konkretləşməsinə xidmət etdiyi üçün xüsusi təhlil prosesində ifaçılıq vəzifəsinin müəyyənləşdirilməsinə zəmin yaradır.

**İfaçılıq vəzifələrinin müəyyənləşdirilməsi.** İfaçılıq vəzifələrinin müəyyənləşdirilməsi dedikdə, ifadəli oxunun vəzifələrinin, əsas məqsədinin, dinləyicilərlə ünsiyyət növlərinin müəyyən edilməsi nəzərdə tutulur. Bu zaman ifaçı əsəri oxuyarkən dinləyicilərə nəyi, hansı məqsədlə çatdıracağını dəqiqləşdirir. Bədii əsəri dərk etmək – onun ideyasını, sənətkarın və ifaçının əsas vəzifəsini anlamaq deməkdir. Sənətkarın və ifaçının əsas vəzifəsi bir-biri ilə sıx əlaqəlidir. Əsərin ifadəli oxusunun əsasında müəllifin əsas niyyətinin aşkara çıxarılması və reallaşdırılması, səslənən sözlə ifadə edilməsi durur [6, s.17]. “Hər romanda, hər əsərdə oxucu və tamaşaçı, ilk növbədə, sənətkarın başlıca fikrini, nə demək istədiyini, nəyi ifadə etdiyini axtarıb tapmaq istəyir” [9, s.118].

Əsərin ifadəli oxusuna hazırlıq zamanı mətn hissələrə ayrılmalı, hər hissədə qarşıya qoyulan ifaçılıq vəzifəsi müəyyənləşdirilməlidir. Bu hissələr, adətən bir neçə abzasdan, bir-biri ilə ideya baxımından əlaqəli olan parçalardan ibarət olur. Dinləyiciyə sözlə fəal təsir göstərmək üçün əsərin oxunuşu zamanı qarşıya qoyulan ifaçılıq vəzifəsi əvvəlcədən müəyyənləşdirilməli və onun reallaşdırılması üçün konkret fəaliyyət istiqaməti, görüləcək işlər dəqiqləşdirilməlidir. İfaçı dəqiq bilməlidir ki, o, bu əsərin ifadəli

oxusu zamanı hansı məqsədə nail olacaq, dinləyicilərdə hansı emosinal ovqat, hiss, həyəcan oyadacaqdır. İfaçılıq vəzifəsinin müəyyənləşdirilməsi dinləyicilərə qəzəb, nifrət, kədər, sevinc, qürur, vətənpərvərlik, qəhrəmanlıq, anaya məhəbbət və s. hisslərin aşılanacağının və bunun necə həyata keçiriləcəyinin aydın dərk edilməsidir.

*İfaçılıq vəzifəsinin müəyyənləşdirilməsi zamanı səsin tembri də müəyyənləşdirilməlidir.* Məlumdur ki, səsin tembri şifahi nitqin və ifadəli oxunun ifadəlilik vasitəsidir. Səs müxtəlif hissləri, yaşanan ovqatı (həyəcan, kədər, heyrət, sevinc, qorxu, fərəh və s.) əks etdirir. Həyəcan içində olan insanın səsi dəyişir, adi axarından çıxır. Səsin belə dəyişməsi, emosional boyası *tembr* adlanır. Səsin emosional çaları, tembri ifaçının qarşıya qoyduğu məqsədə uyğun olaraq yaranır və müəyyən nitq situasiyalarında dəyişir. Məsələn, M.Ə.Sabirin “Əkinçi” şeirində ifaçı harınlamış bəyzadənin əkinçini ittiham edən sözlərini istehza və kinayə ilə oxucuya çatdırır. Əsərin bəyzadənin özünü tərif edən bəndinin oxusu zamanı isə səsin tembrində eqoizm, lovğalıq, özündənrazılıq öz əksini tapmalıdır. Səsin tembri vasitəsilə sözə əks məna da vermək mümkündür. S.Vurğunun “Vaqif” pyesində Vaqifə xəyanət etdikdən sonra, öz hərəkətindən peşman olan Xuraman dərin məyusluq içində həbs olunmuş Vaqifin yanına gəlir. Zindanın pəncərəsi önündə göz yaşları içində Vaqifə müraciət edir.

Xuraman: – Vaqif, ey sevgilim, ey tacidarım!

Vaqif: – Nə var, nə deyirsən, vəfalı yarım?

Bu səhnədə Vaqifin “vəfalı yarım” sözlərindəki kinayəni duyan Xuraman etdiyi xəyanətin ağırlığını dərk edib özünü qayadan atır.

İfa zamanı səsin alacağı tembri müəyyənləşdirmək üçün əsərin ideya-məzmunu, bədii xüsusiyyətləri təhlil olunmalı, müəllifin niyyəti, ifaçılıq vəzifəsi müəyyənləşdirilməlidir.

## Nəticə / Conclusion

Əsərin məzmununun dərindən mənimsənilməsi bədii mətnin təhlili və ifadəli oxusunun səmərəliliyinin mühüm şərtidir. Bədii əsərin ifadəli oxusuna hazırlıq zamanı ifaçının hazırlıq səviyyəsindən, əsərin mürəkkəbliyi və həcmindən asılı olaraq ifaçılıq təhlilinin bu və ya digər mərhələsi üzrə işə xüsusi diqqət yetirilir. İfaçı mətnin məzmununu bütövlükdə qavrayıbsa, əsərin ədəbiyyat dərslərində təhlili aparılmalı, ədəbiyyatşünaslıq materiallarından istifadə etməklə onun ideyası və orada qaldırılan mənəvi-estetik problemlər barədə dolğun bilik əldə edilməlidir.

Bədii əsərin təhlili və ifadəli oxusu üzrə bacarıqların əlaqələndirilməsi şagirdlərin nitqinin, həmçinin bədii mətni qavramaq, təhlil etmək, qiymətləndirmək bacarığının inkişafına səbəb olur, əsərin ideya-məzmununun, sənətkarlıq xüsusiyyətlərinin daha dərindən qavranılması üçün geniş imkanlar açır.

## İstifadə edilmiş ədəbiyyat / References


1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün ədəbiyyat fənni kurikulumu. (2010). V-XI siniflər (Təlim Azərbaycan dilində olan məktəblər üçün). “Azərbaycan müəllimi” qəzeti, 24 dekabr, № 50.
2. Aşıq Ələsgər. (1972). I kitab. Tərtib edəni İ.Ələsgər. Bakı, Elm. 326 s.
3. Həsənli B., Abdullazadə N. (2015). İfadəli oxu. Bakı, Müəllim. 304 s.
4. Həsənli B., Hüseynoğlu S., Məmmədova S., Mustafayeva A. (2021). Ədəbiyyat. 7-ci sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr. 208 s.
5. Hüseynoğlu S. (2010). İfadəli oxunun əsasları. Bakı, ADPU. 254 s.
6. Никольская С.Т., Майоров А.В., Осокин В.В. (1990). Выразительное чтение. Ленинград, Просв., с.17.
7. Методика преподавания литературы. (1985). Под ред. З.Рез. Москва,

368 с.

8. Рез З.Я. (1974). Об особенностях изучения лирики в школе. Современные проблемы методики преподавания литературы. 194 с.
9. Выготский Л.С. (1968). Психология искусства. Москва, Искусство. 480 с.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 23-37
doi.org/10.48445/e4405-5108-7563-e

**M E T O D İ K A**

# Təlim texnologiyası – keys-metod

***Soltan Hüseynoğlu***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent. Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: soltanhuseynoglu@mail.ru
https://orcid.org/0000-0003-4182-6653

**XÜLASƏ**
Dünya təhsil sisteminə inteqrasiya təlimin məzmununda, təşkilində, metodlarında əhəmiyyətli dəyişikliyə səbəb oldu. Bu baxımdan yeni təlim texnologiyaları ilə tanışlıq, onların tətbiqinə səy göstərilməsi diqqəti xüsusilə cəlb edir. Təəssüf ki, bu texnologiyaların mahiyyəti, ümumtəhsil məktəblərində tətbiqinin nə dərəcədə yararlı və faydalı olması pedaqoji elmimizdə qədərincə araşdırılmır. Bu istiqamətdə xüsusi tədqiqatın aparılmasına da lazımınca diqqət yetirilmir. Təcrübədən aydınlaşır ki, treninqlər, tərcümə materialları əsasında mənimsənilən biliklər praktik işin səmərəli təşkili üçün qətiyyən kifayət deyildir. Məqalə yeni texnologiyalardan hesab olunan *keys-metodla* bağlı tədqiqat əsərlərinin əsasında yazılıb və onlardakı fikirlərə münasibət bildirilib. Başlıca məqsəd diqqəti keys-metodun mühüm xüsusiyyətlərinə və ziddiyyətli məqamlarına cəlb etməkdir.

**AÇAR SÖZLƏR**
texnologiya, keys-metod, keys-stadi, situasiya, təsnifat

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 19.02.2023
qəbul edilib: 02.03.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 23-37
doi.org/10.48445/e4405-5108-7563-e

**M E T H O D S**

# Training technology – case-method

***Soltan Huseynoglu***
Doctor of Philosophy in Pedagogy, Associate Professor. Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: soltanhuseynoglu@mail.ru
https://orcid.org/0000-0003-4182-6653

**ABSTRACT**
Integration into the world education system caused a significant change in the content, organization, and methods of education. From this point of view, familiarization with new learning technologies, efforts to apply them, especially attract attention. Unfortunately, clarifying the essence of these technologies, how useful they are for application in our schools, is not investigated as much as in our pedagogical science. Carrying out special research in this direction does not meet the requirements of the day. It is clear from experience that what is mastered on the basis of trainings and translation materials is absolutely not enough for efficient

**KEYWORDS**
technology,
case-method,
case-study,
situation,
classification

**ARTICLE HISTORY**
Received:
19.02.2023
Accepted:
02.03.2023

organization of practical work.The article was written based on the study of research works on the *case-method*, which is considered one of the new technologies, and the ideas in them were expressed as appropriate. The main goal is to draw attention to the important features and contradictory aspects of the case-method.

## Giriş / Introduction

Nəticəsindən asılı olmayaraq, təlimdə yenilik axtarışları həmişə olub. Bu axtarışlar həm təlimin məzmununu, həm də öyrətmə və öyrənmə üsullarını əhatə edib. Dövlət müstəqilliyimiz bərpa olunduqdan sonra bu istiqamətdəki fəaliyyət daha ardıcıl və səmərəli şəkildə gerçəkləşdirilməyə başlandı. Təlimin məzmununda aparılan dəyişiklik texnologiyalarda da yenilənməni tələb edirdi. Başqa sözlə, innovativ təlim yeni texnologiyaların tətbiqini zərurətə çevirmişdi. Müəyyən zaman fərqi ilə yaranan və daha geniş yayılan yeni texnologiyalar aşağıdakılardır:

- inkişafetdirici təlim;
- problemli təlim;
- tənqidi təfəkkürün inkişafı;
- layihələr metodu texnologiyası;
- təlimə differensial yanaşma;
- informasiya texnologiyası və s.

Ümumiyyətlə, texnologiyaların üstünlüyü bir sıra tələblərə cavab vermələri ilə müəyyən olunur. Mühüm hesab olunan tələblər, əsasən, aşağıdakılardır. Texnologiya:

- materialın müstəqil mənimsənilməsi üçün şagirdlərə imkan verməlidir;
- şagirdləri müxtəlif növ fəaliyyətə motivləndirməlidir;
- fəaliyyətin təşkili vasitəsi kimi dəyərləndirməklə müxtəlif informasiya mənbələri ilə işləməyi tələb etməlidir;
- qruplar arasında qarşılıqlı fəaliyyətin təşkilinə şərait yaratmalıdır;
- şagirdlərin idrak fəaliyyətinin müxtəlif sahələr üzrə reallaşmasına rəvac verməlidir;
- çoxlu həcmdə vəzifələrin həllinə imkan yaradan bitkin, tam təlimin təmsilçisi olmalıdır.

Təbii olaraq sual yaranır: Keys-metod bu tələblərə cavab verirmi? Bu tələblərə bütövlükdə cavab verən keys-metod ciddi tədqiqat əsərlərində təlim texnologiyası kimi təqdim olunur. Bəzən təlim metodu kimi də qələmə verilən keys-metodla bağlı pedaqoji

ədəbiyyatda fərqli, bir sıra hallarda isə ziddiyyətli fikirlər səsləndirilmişdir. Onun təsnifatı, tipləri, növləri, həcmi, tətbiqi prosesində istifadə olunan təlim metodları, hətta adının izahında da üst-üstə düşməyən fikirlərə rast gəlmək mümkündür.

Bəs “case” (keys) sözü hansı dilə məxsusdur və mənası nədir? İngilis dilində *case* “əhvalat”, “hadisə” anlamındadır. Belə bir fikir var ki, bu sözün əsasında “mürəkkəb, dolaşıq əhvalat” mənasını ifadə edən, latın dilinə məxsus *casus* kəlməsi dayanır. Pedaqoji ədəbiyyatda keys-metodla (case method) yanaşı, eyni mənada başa düşülən keys-stadi (case-study) – “konkret situasiyanın təhlili metodu” anlayışı da işlənir.

Keys-metodun vətəni Amerika Birləşmiş Ştatlarıdır. Yaranması həyati tələblərlə bağlı olan bu metod ilk dəfə Harvard Hüquq Məktəbində tətbiq edilmişdir. Onu məktəbin əməkdaşı Xristofor Kolumb Lenqdellin adı ilə bağlayırlar. Bu, XIX yüzilliyin sonuna – 1870-ci ilə təsadüf edir. Keys-metodun ardıcıl və geniş tətbiqi Harvard Biznes Məktəbində baş tutmuşdur. Metod birinci mərhələdə – 1910-cu illərdə məktəbdə müstəqil fənn (kurs) olaraq tədris edilmiş və bizneslə məşğul olan insanlar vaxtaşırı ora dəvət edilmişlər. Bu iş adamları istehsalatda qarşılarına çıxan çətinlikləri, problemləri şagirdlərə izah edir, onlar isə araşdırmalar apararaq vəziyyətdən çıxış yolu tapmağa çalışırdılar. İki gündən sonra şagirdlərin hər biri problemin təhlilini və həlli yollarını əks etdirən yazılı hesabat təqdim edirdi. İş adamları hesa-batları şagirdlərin iştirakı ilə müzakirə edirdilər.

İkinci mərhələdə – 1920-ci ildən sonra keys-metodun həmin məktəbdə tətbiqinə daha geniş yer verildi və o, müxtəlif ixtisasları əhatə etdi. 1920-ci illərin əvvəllərində keys-metod haqqında yazılar meydana çıxdı və bu, texnologiyanın müxtəlif tədris ocaqlarında yayılmasına ciddi təsir etdi. Hazırda dünyanın bütün inkişaf etmiş öl-kələrində, xüsusən biznes, menecerlik, iqtisadiyyat və s. ixtisaslar üzrə ali təhsil müəssisələrində keys-metoddan geniş istifadə olunur. Keys-metod Avropa ölkələri-nin, ABŞ-ın orta məktəblərində də uzun zamandır tətbiq olunur və bütün fənləri əhatə edir.

Bir sıra tədqiqatçılar keys-metodun tətbiq tarixini uzaq keçmişə aparır, spartalıların ondan yararlandıqlarını, bu məqsədlə Sokrat təliminə müraciət edildiyini əsaslandırmağa çalışırlar.

**Keys-metodun mahiyyəti və tətbiqi**

İctimai həyatın bütün sahələrində tətbiq olunan keys-metoddan təhsildə istifadə edilməsi müsbət hal kimi dəyərləndirilməlidir. Onun mahiyyətində inkişaf dayanır. Yaranmış mürəkkəb vəziyyətdən (situasiyadan) çıxış yollarının axtarılması düşüncənin fəal işini, idrak fəaliyyətinin aktivliyini tələb edir. Bu, bütövlükdə təfəkkürün inkişafı, zənginləşməsi yolunda səmərəli addımdır. Bütün fənlərin, eləcə də ədəbiyyatın öyrənilməsində keyslərin (problem-tapşırıqların) hazırlanmasına və tətbiqinə geniş imkan vardır. Başqa sözlə, ədəbiyyat fənninin bütün materiallarının, xüsusən bədii əsərlərin öyrənilməsində *təlimi situasiyanın* yaradılması mümkün və faydalıdır. Bu təlimi situasiyadan çıxış yolunun tapılması, problemin həlli variantlarının müəyyənləşdirilməsi, onlardan ən səmərəli olanının seçilməsi keys-metodun başlıca tələbidir. Deməli, keys-metodun əsasında mürəkkəb vəziyyətdən (situasiyadan) çıxış yolunun tapılması, başqa sözlə, problemin həlli dayanır. Bu situasiya təbii (həyati) ola bildiyi kimi, süni şəkildə də yaradıla bilər. Təlim pro-sesində, təbiidir ki, ikinci tip situasiyalar tətbiq edilir. Keysi "sənəd dəsti" şəklində alan şagirdlər situasiya, onun təsviri, əsas və əlavə ədəbiyyat, metodik təminat və s. barədə məlumat əldə edirlər. Araşdırılan problemin birmənalı həlli olmur və bu, şagirdlərdə təkcə əqli fəallığın yox, həm də güclü marağın yaranmasına yol açır. Keyslərin yerinə yetirilməsi prosesində biliklərin əldə edilməsi şagirdlərin müstəqil fəaliyyəti sayəsində mümkün olur. Bu isə onlarda fərqli praktik bacarıqların formalaşmasına əhəmiyyətli dərəcədə təsir edir. Çoxsaylı informasiyalarla işləyən şagirdlər mövcud bilik və bacarıqlarından istifadəyə, praktik təcrübələrini zənginləşdirməyə, qənaətlərini, ideyalarını ifadə etməyə, başqalarının fərqli baxışlarını dinləməyə və onlara münasibət bildirməyə imkan qazanırlar. Bu texnologiyanın tətbiqi prosesində formalaşmasına imkan yaranan bacarıqlar aşağıdakı məzmunda ümumiləşdirilir.

1. Təhlil bacarıqları:
   - təsnif etmək (qruplaşdırmaq);
   - əhəmiyyətli və ikinci dərəcəli məlumatları müəyyənləşdirmək, təhlil etmək.
2. Praktik bacarıqlar:
   - informasiyalarla iş zamanı bilik, metod və priyomlardan istifadə.
3. Yaradıcılıq bacarığı:
   - problemlərin həllinə yaradıcı yanaşma.
4. Kommunikativ bacarıqlar:
   - diskussiya aparmaq;
   - öz mövqeyini müdafiə etmək.

Keys-metodun üstünlükləri bununla məhdudlaşmır. Keyslərlə iş zamanı, yuxarıda qeyd edildiyi kimi, şagirdlərdən addımbaşı müstəqil qərar qəbul etmək, problemli suallara cavab vermək tələb olunur. Deməli, tədris materialını problem (keys) şəklində alan şagird onun haqqında olan biliyi idraki fəallıq göstərməklə, yaradıcı işin nəticəsində əldə edə bilir. Araşdırdığı problemlə bağlı doğru qərar qəbul etməsi üçün şagirdin müxtəlif mənbələrdən məlumat toplaması, təhlil etməsi zərurətə çevrilir. Bu, keys-metodun şagirdləri tədqiqatçı mövqeyində gördüyünü bir daha təsdiq edir.

Keys-metod mahiyyətcə fəal təlim texnologiyası hesab edilir və interaktivlik onun mühüm tələblərindəndir. Bir sıra hallarda (müəyyən mərhələdə) şagirdlərin keys tapşırığı üzrə fərdi işi təşkil edilsə də, son nəticədə onlar kiçik qruplarda birləşir,

problemin həllini başa çatdırırlar. Deməli, bu texnologiyanın tətbiqi prosesində əməkdaşlığın təmin edilməsi zəruri tələb kimi özünü göstərir.

Keys-metodun tətbiqi ilə bağlı mənzərəni ümumi şəkildə belə təsəvvür etmək mümkündür: şagirdlərə tapşırıq dəsti (paketi) təqdim edilir. Bu sənəddə birmənalı həlli olmayan problem, onunla bağlı tapşırıqlar, suallar, istifadə olunacaq əsas və əlavə ədəbiyyat, nəticənin ifadə forması, qiymətləndirmə meyarları əks etdirilir. Beləliklə, keysin məzmun və strukturunu aşağıdakı şəkildə ümumiləşdirmək mümkün olur:

– dərsin mövzusu, problemi;
– mübahisəli situasiyanın təsviri;
– suallar, tapşırıqlar;
– əyanilik, digər illüstrativ materiallar;
– əsas və əlavə ədəbiyyat;
– keyslə iş rejimi;
– işin qiymətləndirilməsi meyarları.

Şagirdlərin yaş və sinfin hazırlıq səviyyəsinə uyğun olaraq, keyslər mürəkkəblik dərəcəsinə görə üç qismə bölünür. Onların adlandırılmasında fikir birliyi yoxdur. Səviyyələr arasındakı fərq nəzərə alınmaqla onları aşağıdakı məzmunda şərh etmək olar:

1. Mürəkkəbliyinə görə birinci dərəcəli hesab edilən keyslər.

Bu qəbildən keyslər şagirdlərə təqdim edilən materiallarda praktik situasiyanın və onun həlli yolunun əks olunmasını tələb edir. Tapşırıq üzərində işləyən şagirdlər aşağıdakı sualların cavablarını aydınlaşdırırlar:

– Situasiyanın həlli üçün təklif olunan yol yararlıdırmı?
– Situasiyanın başqa bir həll imkanı da varmı?

Məsələn, N.Vəzirovun “Müsibəti-Fəxrəddin” əsərinin tədrisində şagirdlərə keys-tapşırıq təklif etmək olar: “Siz tənqidçi Y.Qarayevin “Rüstəm bəyi bu vəziyyətə salan yaşadığı zəmanə, dövrün adətləridir” fikri ilə razısınızmı?

2. Mürəkkəbliyinə görə ikinci dərəcəli hesab edilən keyslər.

Belə keyslər üzrə materiallarda praktik situasiya əksini tapsa da, onun həlli yolu göstərilmir. Tapşırığın üzərində işləyən

şagirdlər praktik situasiyanın həlli yolunu özləri müəyyənləşdirirlər.

Məsələn, X sinifdə oxuyan şagirdləri “XIX əsr ədəbiyyatımızın növ və janr baxımından zənginləşməsinə səbəb nə olmuşdur?” keys-tapşırığının üzərində işlətmək olar.

3. Mürəkkəbliyinə görə üçüncü dərəcəli hesab edilən keyslər.

Belə tapşırıqlar şagirdlərə təklif olunan materiallarda praktik situasiyanın olmasını tələb edir. Tapşırıqların üzərində işləyən şagirdlər:

– tədris materiallarını təhlil etməklə problemi müstəqil olaraq müəyyən edirlər;
– problemin həlli yolunu təklif edirlər.

Məsələn, XI sinif şagirdlərinə C.Cabbarlının “Oqtay Eloğlu” əsərində qaldırılmış başlıca problemi müəyyənləşdirməyi təklif etmək keys-tapşırıq kimi dəyərləndirilə bilər.

Keyslər həcminə görə də fərqlənir. Onlar *tam keys, yığcam keys, mini keys* olmaqla üç yerə bölünür. Tam keys 20-25 səhifədən ibarət olur. O, fərdi, yaxud kiçik qruplar şəklində yerinə yetirilir. Belə keyslərin icrası bir neçə gün çəkə bilər. Onların üzərində iş sinifdə və evdə davam etdirilir. Tədqiqatçıların əksəriyyəti tam keysi orta məktəb üçün məqsədəuyğun hesab etmirlər. Yığcam keysin həcmi 3-5 səhifə olub, dərsdə cütlük şəklində, yaxud kiçik qruplarda yerinə yetirilir. Mini keys 1-2 səhifədən ibarət olub, sinifdə cütlük şəklində, eləcə də kiçik qruplarda icra olunur.

Keys-metodun tətbiqi ilə təşkil olunmuş işin yekunu fərqli formalarda təqdim oluna bilər: şifahi təqdimat, müzakirə, layihənin hazırlanması, inşa, əsaslandırılmış konspekt və s.

Keyslər məzmun və məqsədlərinə görə də qruplaşdırılır:

– praktik keyslər;
– öyrədici (təlimi) keyslər;
– elmi-tədqiqat keysləri.

*Praktik keyslərin* əsasında real həyati situasiyalar dayanır. Başqa sözlə, onların başlıca vəzifəsi həyati situasiyaları bütün incəliklərinə qədər əks etdirməkdir. Bu keyslərin məqsədi (keyslərin məqsədi, yoxsa keyslərin tətbiqində məqsəd?) isə

həyatın dərk edilməsinə və gerçək peşəkar fəaliyyət üzrə bacarıqların qazanılmasına imkan yaratmaqdır.

*Öyrədici (təlimi) keyslər* praktik keyslərdən onunla fərqlənir ki, onlarda təlim və tərbiyəvi vəzifələr ön plana çəkilir. Bu qəbildən keyslərdə situasiya, problem praktik xarakterli olur, süni yaradılır və həyatdakılarla müəyyən mənada səsləşir. Belə keyslər cəmiyyətdə baş verən bu və ya digər hadisənin başa düşülməsində həlledici rola malik olmasa da, ona yanaşma, münasibət bildirmə baxımından faydalıdır.

*Elmi-tədqiqat keyslərinin* başlıca mahiyyətini situasiya haqqında yeni biliyin əldə olunması təşkil edir. Bu keyslərin orta məktəbdə tətbiqi çətindir. Onlardan daha çox peşə bacarıqlarının inkişaf etdirilməsində istifadə edilir. Onlar həmçinin elmi-tədqiqat işləri üzrə müxtəlif fəaliyyət növlərində tətbiq olunur.

Keyslərin hazırlanmasında bir sıra *tələblərin* nəzərə alınması vacibdir. Onlar, əsasən, aşağıdakılardır. Keys:

– hansı məqsədlə yaradılıbsa, ona uyğun olmalıdır;
– təhsilalanların imkanlarına uyğun çətinlik səviyyəsində olmalıdır;
– aktual olmalı, müasir təhsilə cavab verməlidir;
– həll yolunun kollektiv tapılmasına yönlənməlidir;
– bir neçə həll yolunun olması ilə səciyyələnməli, diskussiyaya yol açmalıdır.

Keyslərin tətbiqində izlənilən *məqsədlər* çoxdur. Pedaqoji ədəbiyyatda üzərində daha çox dayanılanlar aşağıdakılardır:

– şagirdlərin fəallaşdırılması;
– tədris prosesinə motivasiyanın yüksəldilməsi;
– informasiya ilə işləmək bacarığının mənimsənilməsi;
– situasiyanın dəqiqləşdirilməsi üçün zəruri olan əlavə informasiyanın əldə olunması;
– situasiyanın qrup şəklində təhlili əsasında doğru nəticənin çıxarılması;
– şəxsi baxışların şifahi və yazılı formada dəqiq, aydın ifadə edilməsi üzrə vərdişlərin əldə edilməsi, əminliklə irəli sürülməsi və müdafiə olunması;

– fərqli baxışların tənqidi qiymətləndirilməsi üzrə bacarıqların yaradılması, müstəqil təhlil, özünənəzarət və özünüqiymətləndirmənin gerçəkləşdirilməsi.

Keys-metodun ardıcıl tətbiqi, keyslərin mükəmməl hazırlanması şagirdlərdə müxtəlifyönümlü *səriştənin* formalaşmasına ciddi təsir edir. Səriştələr və onların səciyyəvi xüsusiyyətləri pedaqoji ədəbiyyatda aşağıdakı kimi ümumiləşdirilir.

1. Qərar qəbul etməyə qadir olmaq (konkret fəaliyyət modelini hazırlamaq və qəbul etmək bacarığı).
2. Təlimə qabiliyyətlilik (yeni bilik axtarışına yiyələnmək və öz fəaliyyətini təşkil etmək bacarığına sahib olmaq).
3. Düşüncədə – təfəkkürdə ardıcıllıq və sistemlilik (situasiyanın hərtərəfli başa düşülməsi və sistemli təhlil edilməsi).
4. Müstəqillik və təşəbbüskarlıq (qeyri-müəyyənlik şəraitində fəal olmaq bacarığı).
5. Dəyişikliklərə, çeviklik tələb edən məqamlara hazır olmaq (dəyişən situasiyaya tez uyğunlaşmaq, yeni şərtlərə alışmaq).
6. İnformasiya ilə işləməyə qabil olmaq (informasiya axtarmaq, onu təhlil etmək, bir formadan başqa bir formaya çevirmək bacarığı).

7. Səbatlılıq və məqsədyönlülük (mövqeyini əsaslandırmaq, müzakirədə iştirak edənlərin müxalif fikirlərinə əks dəlillərlə cavab vermək bacarığı).
8. Kommunikativlik (öz mövqeyini müdafiə etmək, sözdən istifadə, ünsiyyətə girmək bacarığı).
9. Şəxsiyyətlərarası ünsiyyət (müsahibi dinləmək və anlamaq bacarığı).
10. Təfəkkürün problemli vəziyyətə hazırlığı (problemin həlli modelini hazırlamaq bacarığı).

Ümumiyyətlə, səriştəliliyi qısa vaxt ərzində formalaşdırmağın mümkün olduğunu düşünmək yanlışdır. Bunun üçün məqsədyönlü iş və zaman tələb olunur. Bu məqamda digər bir məsələni də xatırlatmaq vacibdir: göstərilən səriştələrin formalaşmasını təkcə keys-metod texnologiyası ilə əlaqələndirmək doğru deyildir. Onların əksəriyyətinin mənimsənilməsi hansı texnologiyanın tətbiqindən asılı olmayaraq, təlim prosesində gerçəkləşir. Əsas mətləb təhsilverənin bu istiqamətdəki işi dərkedilmiş əsasda, planlı şəkildə təşkil etməsidir. Başqa bir mühüm məsələ isə təlim prosesində formalaşdırılması diqqət mərkəzində saxlanılan səriştələrin qarşılıqlı əlaqələndirilməsidir. Bu, şagirdlərin fəaliyyətinin çoxcəhətli və səmərəli olmasına əlverişli imkan yaradır.

Keys-metodla bağlı ədəbiyyatda müşahidə edilən ziddiyyətli məqamlardan biri onun *təsnifatı* ilə bağlıdır. Əvvəla, bir sıra hallarda təsnifat müxtəlif əsaslar üzrə aparıldığından nəticələr də fərqli məzmunda olur. Bəzən isə, təqdim olunanların təsnifat kimi dəyərləndirilməsi inandırıcı görünmür. Məsələn, bəzi tədqiqatlarda “hansı yaradıcılıq işini tələb etməsindən asılı olaraq keys metodları təsnif etmək olar” fikri əsas götürülərək *insident metodu, işgüzar yazışmanın təhlili metodu, situativ təhlil metodu* və s. üzərində dayanılır [Плотников М.И., Чернявская О.С., Кузнецова Ю.В. Нижний Новгород, 2014]. Məntiqsiz görünən odur ki, ciddi tədqiqatlarda bu sadalananlar (insident

metodu, işgüzar yazışmanın təhlili metodu və s.) “keys metodlar” yox, keys-texnologiyanın növ müxtəlifliyi (təzahür formaları) kimi dəyərləndirilir. “Situativ təhlil metodunun” (keys-stadinin) bunların sırasında yer alması sonuncu fikrin tərəfdarlarının mövqeyini möhkəmləndirir. Metodlar (yaxud keys-texnologiyanın növləri, variantları), əsasən, aşağıdakılardır:

- insident metodu;
- işgüzar yazışmanın təhlili metodu;
- oyunlu layihələndirmə metodu;
- rolların oynanılması metodu;
- situativ təhlil metodu (keys-stadi).

Bunların mahiyyətinə nəzər salaq.

*İnsident* (latın mənşəli *insidens* sözündəndir) *əhvalat, hadisə, münaqişə* anlamındadır. Bu metodun (yaxud keys-texnologiya növünün, variantının) tətbiqində informasiyanın əldə edilməsi ön plana çəkilir. Məqsəd isə informasiyanı təhsilalanın özünün toplaması, onunla işləməsi, sistemə salması və təhlil etməsidir. Deməli, bu metodun tətbiqi zamanı problemin həlli üçün təklif olunan tapşırıq dəlillərlə (məlumatla) qədərincə təmin edilməmiş olur. Bir az da dəqiq deyilsə, şagird keysi tam həcmdə almır. Bu qəbildən iş təbiidir ki, icra üçün ayrılmış vaxtın daha çox informasiyanın əldə edilməsi prosesinə sərf olunmasını tələb edir.

*İşgüzar yazışmanın təhlili metodunun* əsasında bu və ya digər situasiyaya, problemə və s. aid olan sənədlərlə, kağızlarla (yazılarla) iş dayanır. Onun tətbiqi zamanı fənn və tədris olunan mövzudan asılı olaraq, şagirdlərə fərqli sahələr üzrə konkret situasiyaya aid eyni sənəd dəsti (paket) təqdim edilir. İştirakçıların hər biri iş üçün məsuliyyət daşıyır və onların müstəqil qərar qəbul etmək hüququ olur. Təqdim olunan keys böyük həcmdə mənbələrin, sənədlərin təhlilini tələb edir.

*Oyunlu layihələndirmə metodunun* əsas məqsədi yeni layihə yaratmaq, yaxud mövcud olanı təkmilləşdirməkdir. Onun tətbiqində şagirdlər kiçik qruplara bölünür və hər biri özünün layihəsini işləyib hazırlayır. Oyunlu layihələndirmə müxtəlif tipdə olur: tədqiqat, axtarış, yaradıcı, analitik, proqnostik.

*Rolların oynanılması metodunun* məqsədi səhnələşdirmə əsasında müəyyən situasiyanın sinif qarşısında canlandırılmasına, ardınca oyun iştirakçılarının davranış və hərəkətlərinə qiymət verilməsinə imkan yaratmaqdır. Bu metod (texnologiya) iki formada özünü göstərir: a) rollu oyun; b) situasiyanın rollarda oynanılması. Bunların arasında oxşarlıqlar olsa da, əhəmiyyətli fərqlər də vardır. Rollu oyunun tətbiqi prosesində iştirakçılara təhlillə bağlı təcrübələrini zənginləşdirməyə imkan verən yeni situasiya təqdim edilir. İştirakçılar situasiyadan uğurla çıxmağın üsullarını işləyib hazırlamalıdırlar. Rollu oyunun özəlliyi ondadır ki,

o, situasiya materialı ilə tanışlığı və obraza çevrilməyi tələb edən (təqdim olunmuş) ssenari üzrə həyata keçirilir.

Situasiyanın rollarda oynanılması isə onunla səciyyələnir ki, iştirakçılar ssenarini, davranış qaydalarını, nəticəni müstəqil müəyyənləşdirərək rolları lazım bildikləri kimi ifa edirlər.

*Situativ təhlil metodu (keys-stadi)* xarici ölkələrdə daha geniş tətbiq edilir. O, şagirdlərə problemi dərindən və hərtərəfli araşdırmaq, informasiya ilə iş zamanı əqli əməliyyatlara tədricən yiyələnmək imkanı yaradır. Onun tətbiqində şagirdlərə situasiyanı əhatəli təsvir edən geniş mətn və tapşırıq təqdim edilir. Tapşırıq praktik xarakterli olsa da, yerinə yetirilməsi fənn üzrə konkret bilik tələb edir. Əksər hallarda isə tapşırığın yerinə yetirilməsi üçün bir neçə fənn üzrə mənimsənilmiş biliklərdən istifadəyə ehtiyac yaranır. Tapşırıqlar o zaman uğurlu hesab edilir ki, onların əsasında problem xarakterli suallar dayanır. Bu suallar cəlbedici və şagirdlərin səviyyəsinə uyğun olmalıdır. İş formalarının (fərdi, kiçik qruplarda və bütün siniflə birgə təlim) inteqrasiyasına xüsusi diqqət yetirilir. Situativ tapşırıqların yerinə yetirilməsi prosesində müəllimin və şagirdin qarşısında fərqli məqsədlər dayanır. Müəllim şagirdlərin fəaliyyət üsuluna yiyələnmələrinə, onun mahiyyətini anlamalarına çalışır. Şagirdlər isə üzərində işlədikləri situasiyaya müvafiq həll yolunu tapmağa cəhd edirlər. Son nəticədə keys-stadi yeni biliklərin və yeni praktik iş vərdişlərinin qazanılmasına imkan yaradır.

Tədqiqatların əksəriyyətində situativ tapşırıqların modeli aşağıdakı məzmunda təsvir olunur:

- tapşırığın adı;
- idraki sual;
- sualla bağlı müxtəlif formada (mətn, cədvəl, qrafik, illüstrasiya və s.) təqdim olunan informasiya;
- bu informasiya ilə iş üçün tapşırıq.

Keys-metodun tətbiqi bir-biri ilə qarşılıqlı əlaqədə olan üç mərhələnin reallaşdırılması sayəsində mümkün olur. Bu mərhələlər məşğələdən əvvəl, məşğələ zamanı və məşğələdən sonra icra olunan işləri əhatə edir. Keys-metodla bağlı tədqiqatlarda bu mərhələlərin hər birində müəllimin və şagirdlərin icra etdikləri

işlər əksini tapmışdır. Bu işlərin ardıcıllığı və məzmunu aşağıdakı cədvəldə təqdim edilir.

**Cədvəl.**

| **İşin ardıcıllığı** | **Müəllimin fəaliyyəti** | **Şagirdlərin fəaliyyəti** |
|---|---|---|
| Məşğələyə qədər | Keysi seçir, müəyyənləşdirir. Şagirdlərin hazırlaşması üçün əsas və yardımçı materialları müəyyənləşdirir. Məşğələni planlaşdırır (ssenari hazırlayır). | Keysi və tövsiyə olunan ədəbiyyatı alır. Fərdi olaraq hazırlaşır. |
| Məşğələ zamanı | Keysin ilkin müzakirəsini təşkil edir. Kiçik qruplar yaradır. Kiçik qruplarda keysin müzakirəsinə rəhbərlik edir, şagirdləri əlavə məlumatlarla təmin edir. | Keysin və problemin dərindən başa düşülməsi üçün suallar verir. Problemin həlli variantlarını işləyir, yoldaşlarının rəyini nəzərə alır. Müstəqil qərarlar qəbul edir, yaxud onların qəbulunda iştirak edir. |
| Məşğələdən sonra | Şagirdlərin işini qiymətləndirir. Qəbul edilmiş qərarları və sualları qiymətləndirir. | Təklif edilmiş formada yazılı hesabat hazırlayır. |

Əlbəttə, keys-metodun müxtəlif metodlarının, (əslində, növlərinin) tətbiqi prosesində, eləcə də müəllimin məqsədindən asılı olaraq, bu mərhələlərin məzmununda və ardıcıllığında müəyyən dəyişikliyin olması təbiidir. Bu gün keyslərin üç növündən danışılır və təbiidir ki, onların hər birinin tətbiqində müəyyən fərqlər müşahidə edilir:

– çap-keyslər (qrafiklərdən, cədvəllərdən, illüstrasiyalardan və s. daha geniş istifadə olunur);
– multimediya-keys (texniki vasitələrdən istifadəyə üstünlük verilir);
– video-keys (filmlərdən, audio və video materiallardan istifadə olunur).

Ümumtəhsil məktəblərində bütün fənlərin tədrisində keyslərdən istifadə oluna bilər. Fənlərin özəlliyini nəzərə alaraq, keys hazırlamaq isə asan deyildir, bu, ciddi peşə hazırlığı, xüsusi səriştə, geniş mütaliə tələb edir. Məktəbdə çalışan müəllimlərə ilk vaxtlar əhəmiyyətli praktik kömək göstərilməlidir. Müəyyən təcrübə qazanan müəllimlərin bu istiqamətdə müstəqil işləyə biləcəklərinə şübhə etməmək olar. Məktəbdə uğurla tətbiq olunanlar isə tədricən dərsliklərə yol tapmalıdır.

Qeyd olunduğu kimi, keys-metodun ədəbiyyat dərslərində tətbiqinə geniş imkan vardır. Bunun uğurla həyata keçirilməsi isə bir sıra vəzifələrin yerinə yetirilməsindən asılıdır. Başlıcası, müəllimlərə praktik kömək göstərilməlidir. Yalnız nəzəri ədəbiyyatla tanışlıq praktik fəaliyyətin səmərəli təşkili üçün yetərli olmur. Deməli, metodika elmi keys-metodun ədəbiyyat dərslərində tətbiqinin elmi-nəzəri əsaslarını işləməli, ondan çıxış etməklə konkret dərs nümunələri hazırlamalı, eksperimentlə yoxlamalı, tövsiyələr qismində məktəbə təklif etməlidir. Keys-metoddan istifadə

etməyi planlaşdıran müəllim unutmamalıdır ki, ədəbiyyat dərslərində bu texnologiyanın tətbiqi, az əvvəl qeyd edildiyi kimi, tədris prosesini daha effektli edir, şagirdlərdə öyrənilən materiala maraq oyadır, idrak müstəqilliyinin, yaradıcılıq qabiliyyətlərinin, emosional-iradi keyfiyyətlərin inkişafına səbəb olur. Yığcam keys qismində bir nümunənin səciyyəvi məqamlarına nəzər salaq.

**Dərsin mövzusu:** C.Məmmədquluzadə. “Anamın kitabı”. Məzmun üzrə iş.

***Problem:*** Qardaşların arasında konflikt olmaya bilərdimi?

***Suallar:***

1. Konfliktin baş verməsinə səbəb nədir?
2. Konfliktin dərinləşməsində günahkar kimdir?
3. Konfliktin iştirakçıları özlərini necə aparırlar?
4. Sizcə, hansı tövsiyələr qardaşların arasındakı konfliktin aradan qalxmasına kömək edərdi?
5. Həyatınızda konflikt baş veribmi?
6. Siz bu vəziyyətdən necə çıxmısınız?

***Tapşırıqlar:***

1. Təklif olunmuş suallara cavab hazırlayın.
2. Obrazların nitqindən mövqelərini qabarıq əks etdirən nümunələr seçib müqayisə edin.
3. Mövzu ilə bağlı yığcam esse, yaxud inşa yazın.

***Əlavə I.*** **Qrupda iş qaydaları.**

1. Qrup sözçüsünü seçin.
2. Məqsədə çatmağın yollarını müzakirə edin.
3. Qrup üzvlərinin hər birinin vəzifəsinə diqqət edin.
4. Qrup üzvlərinin hər birinin tapşırıq aldığına əmin olun.
5. Tapşırıqlar yerinə yetirilərkən bir-birinizi diqqətlə dinləyin, yoldaşlarınızın sözünü kəsməyin, dil tapmağa, anlaşmağa çalışın.
6. Vaxtın keçməsinə nəzarət edin, kənar söhbətə vaxt sərf etməyin, işdən yayınmayın.
7. İşinizin nəticəsini təqdim etməyə hazır olun. Unutmayın ki, nəticələrin təqdimində hər kəs iştirak etməlidir.

***Əlavə II.* Qrup işinin qiymətləndirilməsi meyarları.**

1. Cavabın təqdim olunmuş tapşırığa uyğun olması.
2. Şərhin məntiqiliyi, ardıcıllığı, dəqiqliyi.

3. Hər bir qrup üzvünün keysin tapşırıqlarının yerinə yetirilməsində və nəticələrinin təqdimatında iştirak etməsi.
4. Materialların şərh edilməsi mədəniyyəti.

***Nəticələrin təqdimi.***

Qrup işlərinin nəticələri fərqli formalarda təqdim edilir:

1. Yazılı qeydlər əsasında şifahi təqdimat.
2. Yazılı təqdimat.
3. İnşa.

***Ədəbiyyat***

1. Ədəbiyyat (11-ci sinif üçün dərslik). Bakı: Bakınəşr, 2020.
2. Əlimirzəyev X. Problemlər və xarakterlər dramaturgiyası. Bakı: Yazıçı, 1979.
3. Məmmədquluzadə C. Əsərləri. Dörd cilddə, I cild. Bakı: Öndər, 2004.

## Nəticə / Conclusion

Tədqiqat aşağıdakı nəticənin çıxarılmasına səbəb olmuşdur.

Keys-texnologiyadan ədəbiyyat dərslərində ardıcıl, daha dəqiq deyilsə, hər dərsdə istifadə cəhdi faydalı ola bilməz. İlk növbədə ona görə ki, hər dərs üçün keyfiyyətli keyslərin hazırlanması böyük zəhmət və çox vaxt tələb edir. Az vaxt içində buna nail ola bilməyən müəllimin hazırladığı keyfiyyətsiz keyslər xeyirdən çox zərər verəcəkdir. İkincisi, şagirdləri ardıcıl olaraq dərslərdə gərginlik içində saxlamaq yolverilməzdir. Üçüncüsü, bu texnologiya ayrı-ayrı problemlərin (situasiyanın) araşdırılmasına və həllinə yönəlikdir. Bu isə fənn üzrə *sistemli* bilik və bacarığın formalaşdırılması baxımından səmərəli deyildir. Nəhayət, o dərs uğurlu olur ki, müxtəlif texnologiyaların qarşılıqlı əlaqədə tətbiqi diqqət mərkəzində saxlanmış olur.

Bütün digər təlim texnologiyaları kimi, keys-metodun da güclü və zəif cəhətlərini eksperimentə əsaslanan xüsusi tədqiqatın nəticəsində müəyyən etmək mümkündür. Belə bir tədqiqatın aparılması, bu texnologiya haqqında yeni elmi fikrin, fərqli mövqeyin, əsaslandırılmış nəzəri ümumiləşdirmənin ərsəyə gəlməsinə, maraqlı və faydalı dərs modellərinin hazırlanmasına səbəb ola bilər.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Həbibbəyli İ., Hüseynoğlu S., Həsənli B., Mustafayeva A. (2020). Ədəbiyyat (11-ci sinif üçün dərslik). Bakı, 208 s.
2. Hüseynoğlu S. (2009). Ədəbiyyat dərslərində yeni texnologiyalar: fəal/interaktiv təlim. Bakı, 200 s.
3. Плотников М.И., Чернявская О.С., Кузнецова Ю.В. (2014). Технология case-study. Нижний Новгород, 208 с.
4. https://www.hbs.edu/case-method-project/about/Pages/default.aspx

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 38-49
doi.org/10.48445/k1933-8409-5976-x

**M E T O D İ K A**

# Ali məktəblərdə sadə cümlə və onun növlərinin tədrisinin aktual problemləri

***Gülarə Abdullayeva***
Filologiya üzrə fəlsəfə doktoru, dosent. Azərbaycan Dövlət Pedaqoji Universitetinin
Şəki filialı. Azərbaycan. E-mail: gularabdullayeva@mail.ru
https://orcid.org/ 0000-0003-1162-0275

**XÜLASƏ**
Məqalədə sadə cümlə və onun növlərinin müxtəlif prinsiplər əsasında təsnifinə uyğun olaraq tədrisi prosesində nəzərə çarpan problemlər və onların həlli yolları araşdırılır, yeni təlim texnologiyalarının tətbiqi yolları şərh edilir. Qeyd olunur ki, sadə cümlənin cüttərkibli və təktərkibli, müxtəsər və geniş, bütöv və yarımçıq növlərinin tədrisi zamanı diqqəti onların müqayisəli şəkildə tədrisinə yönəltməli, oxşar və fərqli məqamlar yeni texnologiyaların köməyi ilə müəyyənləşdirilməlidir. Mövzuların bu şəkildə tədrisi prosesində mənimsəmə keyfiyyəti yüksəlməklə bərabər, yeni biliklərin üzə çıxarılması da hədəflənir. Bu zaman öyrənən obyekt deyil, subyekt rolunu oynayır, onlarda tədris prosesinə İKT-nin imkanlarının tətbiqi vərdişləri

**AÇAR SÖZLƏR**
cüttərkibli cümlə, təktərkibli cümlə, yarımçıq cümlə, müxtəsər cümlə, geniş cümlə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 28.01.2023
qəbul edilib: 05.03.2023

aşılanır, eləcə də internet imkanlarından istifadə vərdişləri formalaşır, kreativ düşüncəyə sahib bir mütəxəssis yetişdirilir.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 38-49
doi.org/10.48445/k1933-8409-5976-x

METHODS

# Actual problems of teaching simple sentence and its types in higher school

***Gulara Abdullayeva***
Doctor of Philosophy in Philology, Associate Professor. Sheki branch of Azerbaijan State
Pedagogical University. Azerbaijan. E-mail: gularabdullayeva@mail.ru
https://orcid.org/ 0000-0003-1162-0275

**ABSTRACT**
The article examines the noticeable problems in the process of teaching simple sentences and their types according to their classification based on various principles and their solutions. Ways of applying new learning technologies during the teaching of different types of simple sentences are explained. It is noted that during the teaching of each of the two-component and one-component, brief and broad, complete and incomplete types of a simple sentence, attention should be focused on teaching them in a comparative manner, similar and different points should be determined comparatively with the help of new technologies. In the process of teaching subjects in this way, the mastery quality is increased, new knowledge is revealed, the learner plays the role of a subject and not

**KEYWORDS**
dual containing sentence,
single sentence,
incomplete sentence, concise sentence, broad sentence

**ARTICLE HISTORY**
Received: 28.01.2023
Accepted: 05.03.2023

an object in this process, the habits of applying the possibilities of ICT to the educational process are inculcated in them, as well as the habits of using the Internet are formed, a specialist with creative thinking is grown.

## Giriş / Introduction

Azərbaycan dilində sadə cümlənin özünəməxsus təsnif prinsipləri vardır. Bu prinsiplərin hər birinə uyğun olaraq, sadə cümlənin dilimizdə müxtəlif növləri qeyd edilməkdədir. Bu məsələlərin tədrisi zamanı ənənəvi metodlardan daha çox, yeni texnologiyalara üstünlük verilməli, innovasiyaların tətbiqini həyata keçirməklə öyrənən tərəfin fəallığı təmin edilməlidir.

Cümlənin, onun sadə növünün təsnif prinsiplərinin öyrənilməsi dilin yaxşı mənimsənilməsi baxımından son dərəcə vacib və əhəmiyyətlidir. Azərbaycan dilçiliyinə dair yazılmış elmi ədəbiyyatlarda cümlə problemi ilə bağlı kifayət qədər məlumat verilmiş, fərqli meyarlar əsas götürülməklə təsnif edilmişdir [4, s.77-88; 2, s.130-146; 1, s.99-105]. Cümlənin ilkin təsnif prinsipi kimi məqsəd və intonasiyaya görə aparılan bölgü əsas götürülmüşdür. Əslində, cümlənin təsnif prinsiplərinin sıralanmasında ilk yerdə üzvlərə ayrıla bilməsinə görə aparılan bölgü durmalıdır. Çünki ünsiyyət prosesində gündəlik istifadə etdiyimiz cümlələr bilavasitə üzvlənən cümlələr olub, onların təsnif prinsipləri də, əsasən, cümlə üzvlərinin, cümlənin qrammatik əsasının iştirakı ilə əlaqəlidir. Dilçilik ədəbiyyatında bu məsələyə münasibət hər zaman müxtəlif olmuşdur. Cümlənin tədrisi prosesində qarşıya çıxa biləcək çətinlikləri aradan qaldırmaq məqsədilə bu xüsusiyyət ilk olaraq öyrədilməli, “üzvlənən”, “üzvlənməyən” terminlərinin mahiyyəti açıqlanmalıdır. Bundan sonra üzvlənən cümlələrdən olan sadə cümlə və onun cüttərkibli, təktərkibli, müxtəsər, geniş, bütöv, yarımçıq növlərinin tədrisini qarşılıqlı müqayisələrlə həyata keçirmək mümkündür. “Cümlə” bəhsinin tədrisinin düzgün qurulması səlis nitqin formalaşmasına, eləcə də dilin mənimsədilməsinə müsbət təsir etmiş olur.

**Tədqiqat mövzusunun interpretasiyası**

Tədris prosesində qabaqcıl pedaqoji texnologiyalardan istifadə, interaktiv təlim metodlarının tətbiqi müəllimin işini asanlaşdırmaqla bərabər, fənnə marağın artmasına, təlim prosesinin daha da inkişaf etməsinə səbəb olur. Ənənəvi təlim metodları ilə yanaşı, yeni metodlardan istifadə, pedaqoji texnologiyaların tətbiqi öyrənənlərin

dərs prosesi zamanı passivliyinin qarşısını alır, şüurlu mənimsəməyə şərait yaradır. Nəticədə, təlim prosesi təhsilalanda fəallığı, məntiqi düşünməyi, ətrafdakı əşya və hadisələrə tənqidi yanaşmağı, müstəqil bilik almağı, fərdi inkişaf etmək bacarığını tərbiyə edir. Bir sözlə, tədris prosesində yeni pedaqoji texnologiyaları məqsədəuyğun və kompleks şəkildə tətbiq etməklə təhsilalanın hərtərəfli şəxsiyyət kimi inkişaf etməsinə, daha yüksək uğurlar qazanmasına nail olmaq mümkündür.

Bu zaman məqsədə və təlimin məzmununa uyğun seçim etmək əsas şərtdir. Şəxsiyyətyönümlü-inkişafetdirici pedaqoji texnologiyalardanolan əməkdaşlıqla təlim texnologiyası, layihələr metodu ilə təlim texnologiyası, modulla təlim texnologiyası hazırda daha çox istifadə olunan texnologiyalardandır [8, s.53]. İnteraktiv təlim metodları, yeni pedaqoji texnologiyalar digər fənlərdə olduğu kimi, Azərbaycan dilinin, o cümlədən sintaksisin tədqiqat obyekti olan cümlə, həmçinin sadə cümlə və onun növlərinin tədrisi prosesində də müsbət nəticə verir. Bu vasitələr təkcə orta ümumtəhsil müəssisələrində deyil, ali məktəblərdə də tətbiq edilməlidir.

Sintaksis, qrammatikanın daha mürəkkəb dil vahidlərini öyrənən bir şöbəsi kimi dilin mənimsənilməsində, həmçinin nitqin düzgün formalaşmasında mühüm əhəmiyyət kəsb edir. Sintaksisin tədqiqat obyekti olan cümlə isə ünsiyyyətin əsasını təşkil edən dil vahidi kimi daha mükəmməl öyrədilməli, Azərbaycan dilində cümlənin qurulması, onun komponentləri, cümlə üzvləri, cümlədə işlənib cümlə üzvü ola bilməyən, lakin fikrin daha dəqiq ifadə olunmasında rolu olan başqa vasitələr, aktual üzvlənmə, sadə cümlənin cüttərkibli və təktərkibli, müxtəsər və geniş, bütöv və yarımçıq cümlə növləri kimi məsələlərin tədrisinə xüsusi önəm verilməlidir. Bu da müəllimdən cümlənin tədrisi zamanı daha çox diqqət və peşəkarlıq tələb edir. Dərs prosesində yeni texnologiyalardan səmərəli istifadə müəllimin işini bir qədər asanlaşdırır.

Cümlə ilə bağlı bir mövzunun tədrisi üzərində dayanmaqla fikrimizi izah edək: Sadə cümlə ilə bağlı tədris olunan mövzulardan biri “Sadə cümlənin baş üzvlərin iştirakına görə növləri: Cüttərkibli və təktərkibli cümlələr”dir. Ali məktəblərdə bu mövzu üzrə mühazirə və seminar məşğələlərin keçirilməsi nəzərdə tutulur. Müəllim mühazirədə mövzu üzrə lazımi məlumatları çatdırmalı, seminar məşğələsində onun nə dərəcədə mənimsənilməsini yoxlamalıdır. Əvvəllər ənənəvi olaraq müəllim auditoriyada mühazirə oxuyur, öyrənənlər isə dərsdə passiv olaraq dinləyici kimi

iştirak edirdilər. Lakin təcrübə göstərir ki, bu cür mühazirələr yorucu və maraqsız olur. Mühazirə mətni əvvəlcədən hazırlanıb tələbələrə verildikdən və onların mövzu ilə ilkin tanışlığından sonra dərs daha maraqlı keçir. Bu zaman öyrənən tərəf mövzu haqqında məlumat əldə edir, nəyi öyrənəcəyini və nəyi öyrənmək istədiyini müəyyənləşdirir. Beləliklə, mühazirə hər iki tərəfin aktiv iştirakı ilə qurulur. Mühazirə mətni tələbələrə əvvəlcədən təqdim edildiyindən, müəllim dərs prosesi zamanı problem situasiya yaratmaqla bəzi məsələlərin araşdırılmasını, tələbələri müəyyən suallara cavab verməyə istiqamətləndirməklə daha yaxşı nəticə əldə edə bilir. Tələbələrin sadə cümlənin növləri haqqında müəyyən məlumatı olduğundan, bu məlumatlara istinad etməklə

müəllim mühazirədə motivasiya qurmaq üçün onlara *"İçəri istidir"*, *"İçəridə istidir"* cümlələrini təqdim edir və onların bir-birindən nə ilə fərqləndiyini, cümlələrdə işlənən "içəri" və "içəridə" sözlərinin sintaktik mövqeyi ilə bağlı nə düşündüklərini soruşur. Müəllim cavabları qəbul edərək, "Nə üçün ikinci cümləyə mübtəda əlavə edə bilmirik?" ‒ sualı ilə mühazirə mövzusunun cüttərkibli və təktərkibli cümlələrə həsr olunacağını elan edir. Mühazirələrdə İKT-dən istifadə edən müəllim müəyyən məsələləri izah edərkən hazırladığı slaydları da nümayiş etdirə bilər. Məsələn, "Xəbər əsasında formalaşan təktərkibli cümlələr"lə bağlı hazırlanmış slaydı nümayiş etdirməzdən əvvəl, müəllim tələbələrdən şəxssiz və qeyri-müəyyən şəxsli cümlələrin fərqini soruşmalıdır. PowerPoint proqramı imkan verir ki, cavab alındıqca cədvəl hissə-hissə ekrana gəlsin. Cavabları genişləndirmək, təktərkibli cümlənin bu iki növünün oxşar və fərqli cəhətlərini müəyyənləşdirmək üçün Venn diaqramından da istifadə etmək olar. Göründüyü kimi, əlavə vaxt itkisinə yol vermədən tələbələrin fəallığını təmin etməklə slayd vasitəsilə oxşar və fərqli məqamların əyani şəkildə nümayişi mümkündür. Bundan sonra bu iki cümlə növünün başlıca fərqi kimi cümlənin mübtədasının təsəvvür dərəcəsi və xəbərin hansı şəxsdə olması ətraflı izah edilməlidir. Bu zaman tələbələrin mülahizələrini dinləmək, cavablarda olan səhvlərə izahat verərək düzəliş etmək məqsədəuyğundur. Cümlə növlərinin tədrisi zamanı xəbər əsasında formalaşan təktərkibli cümlələrin yaranma düsturu izah edilməli və aşağıdakı məqamlar xüsusilə diqqətə çatdırılmalıdır:

1. Xəbər əsasında formalaşan təktərkibli cümlələrin adında işlədilən "şəxs" sözü lüğəvi mənada şəxs anlayışını deyil, qrammatik şəxsi, yəni mübtədanı ifadə edir. Şəxssiz cümlə dedikdə, cümlədə şəxsin iştirak etmədiyi deyil, mübtədanın yoxluğu nəzərdə tutulur. Məsələn, "Mənə soyuqdur" cümləsini ona görə şəxssiz cümlə adlandırırıq ki, bu cümlənin mübtədası yoxdur və onun bərpası, təsəvvürü də mümkün deyil. Əslində isə bu cümlədə şəxs – "mənə"

əvəzliyi iştirak etmişdir. Deməli, bizi şəxsin iştirakı yox, mübtədanın olmaması maraqlandırır [3, s.227].

2. Bütün şəxssiz cümlələrin xəbəri bir qayda olaraq III şəxsin təkində olur. Lakin xəbəri III şəxsin təkində olan bütün cümləlləri şəxssiz cümlə adlandırmaq olmaz. Belə cümlələr, həmçinin cüttərkibli bütöv, cüttərkibli yarımçıq cümlə də ola bilər.

3. Qeyri-müəyyən şəxsli cümlələrin xəbəri bir qayda olaraq III şəxsin cəmində olur. Lakin xəbəri III şəxsin cəmində olan bütün cümlələri qeyri-müəyyən şəxsli cümlə adlandırmaq olmaz. Belə cümlələr, həmçinin cüttərkibli bütöv, cüttərkibli yarımçıq, ümumi şəxsli cümlə də ola bilər.

4. Ümumi şəxsli cümlələrin xəbəri bir qayda olaraq I, II şəxsin təkində və III şəxsin cəmində olur. Lakin xəbəri bu şəxslərlə ifadə olunan bütün cümlələri ümumi şəxsli cümlə hesab etmək olmaz. Belə cümlələr, həmçinin cüttərkibli bütöv, cüttərkibli yarımçıq, qeyri-müəyyən şəxsli cümlə də ola bilər.

5. Mübtədası I, II şəxsin tək və ya cəmində olub, üslubi məqamla əlaqədar buraxılmış cümlələr nəinki təktərkibli cümlə hesab edilmir, hətta belə cümlələr bütöv cümlələrə aid edilir. Ümumiyyətlə, cüttərkibli və təktərkibli cümlələrin tədrisi zamanı müəllim aşağıdakı məsələlərin izahına xüsusi diqqət yetirməlidir: Cüttərkibli cümlələr baş üzvlərin hər ikisinin iştirakı ilə qurulan sadə cümlələrdir. Bu cümlələrdə, adətən, fikir predmeti mübtəda və ya mübtəda qrupu şəklində, fikir predmetinin hərəkət və əlaməti xəbər və ya xəbər qrupu şəklində ifadə olunur. Məsələn, *Mən sizin belə düşünməyinizdən də incimirəm* (İ.Əfəndiyev); *Gülmirənin marağı daha da artdı* (Ə.Hacızadə). Cüttərkibli cümlələrdə mübtəda əksər halda məntiqi subyektə, xəbər isə məntiqi predikata uyğun gəlir. Cümlə geniş olduqda iki zonaya, yəni mübtəda və xəbər zonasına ayrılmış olur. Mübtəda ona aid olan üzvlə – təyinlə birlikdə mübtəda zonasını, xəbər isə ona aid olan üzvlərlə – tamamlıq, zərflik və təyinlə birlikdə xəbər zonasını əmələ gətirir. Məsələn, *"Havada süzən iri bir çalağanın kölgəsi çəpərin üstündən aşıb, həyətin ortası ilə tövləyə doğru süründü"* (İ.Şıxlı) cümləsində subyekt mübtəda zonasına

*(havada süzən iri bir çalağanın kölgəsi)*, predikat isə xəbər zonasına *(çəpərin üstündən aşıb, həyətin ortası ilə tövləyə doğru süründü)* uyğun gəlir.

Cüttərkibli cümlələr dildə ən çox işlənən cümlə növüdür, buna görə də onlar bədii əsərlərin dilində böyük üstünlük təşkil edir.

Mövzunun tədrisi zamanı cüttərkibli cümlələrin qurulmasında hər iki baş üzvün iştirakının vacibliyi xüsusi olaraq vurğulanmalıdır. Lakin bəzən təkrara yol verməmək, fikri sadə, səlis və yığcam ifadə etmək üçün cümlələrin mübtədası buraxılır, mübtəda bilavasitə cümlədə iştirak etmir. Bu cür cümlələrin mübtədasını mətnə əsasən asanlıqla bərpa etmək mümkün olduğundan, onlar da cüttərkibli cümlə hesab edilir. Məsələn, *“Bu fikirlərdən Zərnigar xanım dəhşətə gəldi”*; *“Suyun soyuq havasını üzündə hiss edib geri çəkildi”* (İ.Şıxlı) cümlələrindən birincisində mübtəda *(Zərnigar xanım)* iştirak etmiş, ikinci cümlədə onu təkrarlamağa ehtiyac olmamışdır. Əvvəlki cümləyə əsasən, bu cümlənin mübtədasını müəyyənləşdirmək və bərpa etmək mümkün olur. Bu cür cümlələr mübtədası bərpa edilə bildiyi üçün *cüttərkibli*, buraxıldığı üçün *yarımçıq* cümlə adlanır. Yersiz təkrara yol verməmək, bədii əsərin dilinin gözəlliyi, səlisliyi, bədiiliyi, sadə və yığcamlığını təmin etmək üçün belə cümlələrdən bədii əsərlərdə geniş istifadə olunur. Lakin I, II şəxsin tək və cəmində olub, *mən, sən, biz, siz* əvəzlikləri ilə ifadə olunan mübtədalar da buraxıla bilir. Belə cümlələrin mübtədasını müəyyənləşdirmək üçün mətnə ehtiyac olmur, xəbərdəki şəxs sonluğu bunu aydınlaşdırmağa imkan verir. Məsələn, *Ovçuluğa meyl saldım, gecə-gündüz çöldə qaldım* (S.Vurğun*).* Bu cümlədə *“mən”* mübtədası işlənməmişdir. Türkologiya elmində belə cümlələrin cüttərkibli və ya təktərkibli olması barədə müxtəlif fikirlər səsləndirilir. Bəzi alimlər belə cümlələri *təktərkibli müəyyən şəxsli cümlələr* adlandırır. Əslində isə belə cümlələr *cüttərkibli*, həm də *bütöv* cümlələr hesab edilir.

III şəxs bütün canlı və cansız varlıqlara aid olduğunda həmin şəxsdə olub, buraxılmış mübtədanı yalnız mətnə əsasən dəqiq müəyyənləşdirmək mümkündür. Məsələn, *Baxır.* Bu cümlənin mübtədasını mətni və ya situasiyanı nəzərə almadan dəqiq

müəyyənləşdirmək olmaz. Ona görə də belə cümlələr *yarımçıq*, daha doğrusu, *cüttərkibli yarımçıq* cümlə hesab olunur.

Sadə cümlələrin tədrisi prosesində diqqət yetirməli məqamlardan biri də müxtəsər və geniş cüttərkibli cümlələrdir. Cüttərkibli cümlələr ikinci dərəcəli üzvlərin iştirakına görə müxtəsər və geniş olur. Müxtəsər cüttərkibli cümlələr yalnız baş üzvlərdən – mübtəda və xəbərdən ibarət olur. Məsələn, *Yağış yağırdı*; *Havalar istiləşdi*; *Suyun üzü titrədi.*

Bəzən müxtəsər cüttərkibli cümlənin baş üzvləri ismi və feili birləşmələrlə ifadə olunur, cümlənin həcmi böyüyür, cümlə zahirən geniş cümləyə oxşayır, lakin müxtəsər olaraq qalır. Məsələn, *Hamıdan çox sevinən (mübtəda) Qulunun uşaqları oldu (xəbər)* (Ə.Haqverdiyev)*; Məni narahat edən (mübtəda) sizin belə düşünməyinizdir (xəbər)* (İ.Əfəndiyev). Verilən cümlələr yalnız baş üzvlərdən ibarət müxtəsər cümlələrdir.

Cüttərkibli cümlələr feili və ismi xəbərli, təsdiq və inkar ola bilər [3, s.225].

Müxtəsər cümlələrdə baş üzvlərin ətrafında ikinci dərəcəli üzvlər (*təyin, tamamlıq və zərflik*) toplanmaqla geniş cümlə əmələ gəlir. Tərkibindəki ikinci dərəcəli üzvlərə görə geniş cümlələri də qruplaşdırmaq olar [4, s.179].

Müəllim mövzunun tədrisi zamanı bildirməlidir ki, cüttərkibli cümlələrdən fərqli olaraq, təktərkibli cümlələr baş üzvlərin yalnız biri əsasında formalaşır, yəni digər baş üzvün iştirakına ehtiyac qalmır. Məsələn, *Payızın ilk günləri idi* (İ.Şıxlı)*; Şirəlinin evləndiyi zamandan çox keçir* (S.Rüstəmxanlı). Bu cümlələr baş üzvlərdən yalnız xəbərin iştirakı ilə qurulmuşdur. Burada mübtəda yoxdur və onun bərpası da mümkün deyildir.

Xəbər əsasında qurulan təktərkibli cümlələr mübtədanın təsəvvür dərəcəsindən asılı olaraq qeyri-müəyyən şəxsli, ümumi şəxsli, şəxssiz cümlələr olmaqla üç növə ayrılır. Mübtəda əsasında qurulan təktərkibli cümlələr isə *adlıq cümlələr* adlanır.

Beləliklə, dilimizdə təktərkibli cümlələrin qeyri-müəyyən şəxsli, ümumi şəxsli, şəxssiz, adlıq cümlələr olmaqla dörd növü qeyd edilir. Xəbər əsasında formalaşan təktərkibli cümlələrdə bütün ikinci dərəcəli üzvlər iştirak edə bilər. Adlıq cümlələrdə isə bu cəhət məhduddur – yalnız təyin və determinant üzvlər (zaman, yer zərflikləri və s.) işlənə bilir.

Xəbər əsasında qurulan təktərkibli cümlələrdə müəyyən bir iş, hərəkət, hadisə haqqında məlumat verilir, soruşulur, biri işə təhrik edilir. Adlıq cümlələrdə isə yalnız əşya və hadisələrin adı çəkilir, onlar haqqında heç bir əlavə məlumat verilmir.

Təktərkibli cümlələr haqqında məlumat verərkən müəllim ümumi şəxsli cümlələrə formal olaraq mübtəda bərpa etməyin mümkünlüyünü, lakin bu prosesin cümlənin ifadə etdiyi ümumiləşmiş, mücərrəd mənaya zidd olduğunu vurğulamalı və bu cümlələr haqqında aşağıdakıları diqqətə çatdırmalıdır: Ümumi şəxsli cümlələr hamıya aid olan, hər yerdə, həmişə müşahidə edilən, bir qayda şəklini almış iş, hərəkət və hadisəni, ümumiləşmiş şəxsi bildirir. Ona görə də təktərkibli cümlənin bu növü əksər halda atalar sözü və məsəllərdən, hikmətli sözlərdən, aforizmlərdən, müxtəlif monolit cümlələrdən ibarət olur.

Ümumi şəxsli cümlələrin xəbəri II şəxsin təkində, III şəxsin cəmində, bəzən də I şəxsin təkində olur. Məsələn, *Sözün doğrusunu zarafatla deyərlər*; *Yıxılana balta çalmazlar*; *Özünə rəva bilmədiyini başqasına rəva bilmə*; *Öz adımı sənə qoyum, səni yana-yana qoyum* (Atalar sözləri).

Ümumi şəxsli cümlələrdə də mübtədanın olmaması natamamlıq yaratmır. Belə cümlələr xəbəri və ya ikinci dərəcəli üzvləri (biri, bir neçəsi) buraxıldıqda yarımçıq olur.

Şəxssiz cümlə dedikdə, şəxsin iştirak etməməsi deyil, qrammatik şəxsin yoxluğu başa düşülür. Şəxssiz cümlələrin xəbəri bir qayda olaraq, həmişə III şəxsin təkində olur. Məsələn, *Novruzun axırıncı çərşənbəsi idi* (İ.Şıxlı)*; Vallah, mənim adım çıxıb* (M.Hüseyn)*; Vahidin sifətini tər götürmüşdü* (İ.Hüseynov).

Müəllim nümunələr verməklə prosesi öyrənən tərəfin özünün izah etməsinə nail ola bilər. Bütün sadə cümlə növlərinin tədrisi prosesində müqayisələr aparmaq, müəyyən problem suallar qoymaqla tələbələrin fəallığını artırmaq mümkündür. Təktərkibli və cüttərkibli cümlələr tədris olunub başa çatdıqdan sonra isə onların bir-biri ilə müqayisəsini apararaq oxşar və fərqli cəhətləri müəyyənləşdirmək mövzuların daha yaxşı mənimsənilməsinə kömək edir. Təcrübə göstərir ki, müəllim belə məqamlarda

bu cümlə növləri ilə bağlı bədii ədəbiyyatdan seçilmiş nümunələri təqdim edərək onların növünün müəyyənləşdirilməsini qarşı tərəfə tapşırdıqda müsbət nəticələr əldə edir. Bu zaman öyrənən tərəf əldə etdiyi nəzəri bilikləri praktik olaraq tətbiq etməklə cümlələrin növünü ayırd etməyi bacarır. Müəllim isə deyilənlər içərisində səhv fikirləri düzəltməli, məsələlərin mahiyyətini izah etməlidir. Ali məktəb proqramında sadə cümlə ilə bağlı tədris edilən məsələlərdən biri də bütöv və yarımçıq cümlələrdir. Çox zaman tələbələr yarımçıq cümləni – üzvləri az olan və ya baş üzvlərindən biri olmayan cümlə forması kimi başa düşürlər. Ona görə də mövzunun tədrisi zamanı, ilk növbədə, “bütöv” və “yarımçıq” sözlərinin mahiyyəti açılmalı, cümlələrin belə adlandırılması səbəbi izah edilməlidir. Müəllim qarşı tərəfə izah etməlidir ki, belə cümlələrdə natamamlıq fikrin ifadə olunmasında deyil, fikrin ifadəsinə xidmət edən, lakin faktiki olaraq cümlədə üzvlərin hamısının öz yerində işlənməməsindədir. Müəllimin diqqət yetirməli olduğu məqamlardan biri də ondan ibarətdir ki, bütöv və yarımçıq cümlələr heç də sadə cümlənin yeni bir növü olmayıb, cüttərkibli və təktərkibli, müxtəsər və geniş cümlələrdə üzvlərdən bu və ya digərinin buraxılması zamanı formalaşır.

Fikrin ifadəsi üçün lazım olan üzvlərindən biri və ya bir neçəsi buraxılan, lakin asanlıqla bərpa edilə bilən cümlələr *yarımçıq cümlələr* adlanır. Yarımçıq cümlənin iki növü vardır: mətni yarımçıq cümlələr, situativ yarımçıq cümlələr.

Yarımçıq cümlələrin tədrisi prosesində mübtədası buraxılmış yarımçıq cümlələrlə mübtədası olmayıb, yalnız xəbər əsasında

formalaşan təktərkibli cümlələri, xəbəri buraxılmış yarımçıq cümlələrlə xəbəri olmayıb, yalnız mübtəda əsasında qurulan təktərkibli cümlələri – adlıq cümlələri müqayisəli şəkildə fərqləndirməyə xüsusi diqqət yetirilməlidir. Müəllim oxşarlıq təşkil edən bu cümlə növlərinə aid nümunələrdən ibarət slaydı təqdim etməklə onların başlıca fərqinin nədən ibarət olduğunu xüsusilə vurğulamalı, nəzərə çatdırmalıdır ki, təktərkibli cümlələrdə olmayan mübtəda və xəbərin təsəvvür edilməsi, bərpası mümkün deyil, fikrin ifadə olunması və cümlənin qurulmasında onlara ehtiyac duyulmur. Yarımçıq cümlələrdə isə fikrin ifadəsinə xidmət edən bu cümlə üzvləri sadəcə olaraq buraxılmış və onların asanlıqla bərpa edilməsi, cümləyə daxil edilməsi mümkündür.

Sadə cümlə növləri arasındakı bu oxşarlıq onların bir-biri ilə müqayisəsini aparmağa imkan verir ki, müəllim seminar məşğələsi zamanı tələbələrdən bu iki cümlə növünü bir-biri ilə müqayisə etməyi tapşıra bilər. Bu zaman Venn diaqramından istifadə etmək faydalı olar. Əvvəlcə təktərkibli cümləyə xas olan xüsusiyyətlər sadalanır, sonra yarımçıq cümlə xarakterizə edilir, daha sonra isə onların oxşar və fərqli cəhətləri müqayisə olunur. Bu cür müqayisələrin nümunələr əsasında aparılması mövzunun daha yaxşı mənimsənilməsinə səbəb olur. Bu üsuldan istifadə etməklə yarımçıq cümlələrin daxili növlərini də müqayisə etmək mümkündür. Onlar arasında qarşılıqlı şəkildə müqayisə apararaq kifayət qədər fərqin olduğu qeyd edilməlidir. Seminar məşğələlərində müəllim tələbələrə ev tapşırığı olaraq belə müqayisələr aparmağı tapşıra bilər.

Ümumiyyətlə, sadə cümlə növlərinin tədrisi prosesində mövzudan asılı olaraq, interaktiv təlim metodlarından istifadə etmək müsbət nəticə verir. Müəllim tədris edəcəyi mövzudan asılı olaraq metod və priyomları düzgün seçməli, qarşıya qoyduğu məqsədə nail olmalıdır. Bəzən bu metodlardan kombinə olunmuş şəkildə, bəzən də ayrı-ayrılıqda istifadə edilə bilər.

Sadə cümlə növlərinin tədrisi zamanı yeni təlim metodlarından istifadəyə dair nümunələrə diqqət yetirək:

**Klaster (şaxələndirmə) metodu**

Klaster metodundan hər hansı bir mövzu və ya fikrin mümkün qədər açılmasında, öyrənənlərin bu sahədə geniş, sərbəst düşünmə mərhələsində istifadə etmək olar. Bu metoddan müəllim həm mühazirə, həm də seminar məşğələlərində istifadə edə bilər. Şaxələndirmə metodunu tətbiq etmək üçün iri ağ kağız götürülür. Kağızın mərkəzində hər hansı termin, söz, cümlə və s. yazılır. Klaster metodu cümlə növlərinin tədrisinin yekunlaşdırılması mərhələsində daha faydalıdır. Məsələn, müəllim cümlə növləri haqqında bilikləri möhkəmləndirmək məqsədilə qruplara verilmiş kağızın ortasına "sadə cümlə" yazır. Qruplar onlara verilmiş tapşırığı bildikləri kimi klasterləşdirirlər, sonda müəllim kağızları lövhədən asır və ümumiləşdirir. Nəticədə, maraqlı bir sxem alınır.

**Dəyirmi masa metodu**

Bu metodda da qruplarla iş formasından istifadə olunur. Hər qrupa bir vatman kağızı və qrupun üzvlərinin sayı qədər rəngli marker verilir. Hər kəs ona verilən markerdən istifadə etməlidir. Yazılı "Dəyirmi masa" elə metoddur ki, bu zaman tapşırıq yazılmış vərəq qrupun daxilində dairə üzrə daim bir nəfərdən digərinə ötürülür. Məsələn, cümlə növlərinə aid hər hansı bir fikir yazılır, sonra vərəq qrupa verilir. Qrup üzvlərinin hər biri mövzu ilə bağlı öz mülahizələrini vərəqə əlavə edir. Məsələn, müəllim kağızın üzərində "Qafar dayı söz alıb ayağa duranda həmişə onun maraqlı söhbətlərinin şahidi olanlar alqışlayaraq səbirsizliklə onun nə barədə danışacağını gözləməyə başladılar" cümləsini yazır və tələbələrə həmin cümlənin təhlili, növü ilə bağlı müəyyən fikir yazmağı tapşırır. Sonda həmin cümlə haqqında bütün xüsusiyyətlər qeyd olunur. Təqdimat zamanı bütün yazılanların düzgünlüyü

müəllim tərəfindən yoxlanır, səhvlər varsa, izah edilir. Nəticədə, müəllim bu metoddan istifadə etməklə mövzu üzrə bilik və bacarıqları dəyərləndirmiş olur. Mövzu ilə bağlı bu metoddan istifadə etməklə başqa bir tapşırıq da vermək olar. Müəllim qruplarla iş üsulundan istifadə etməklə bir mövzu üzrə kiçik bir esse yazmağı tapşırır və hər qrupa esse yazarkən cümlələri cüttərkibli və ya təktərkibli, bütöv və ya geniş cümlə kimi formalaşdırmağı tapşırır. Bu tapşırığın icrası nəticəsində müəllim tələbələrin cavabını iki aspektdən qiymətləndirmək imkanı əldə edir.

**"Dəyirmi masa"** metodundan sintaksisin bütün məsələlərinin öyrədilməsi zamanı istifadə etmək olar.

İnteraktiv təlim metodlarından biri də **"Karusel"** metodudur. Ali məktəb səviyyəsində seminar məşğələlərinin təşkilində bu metoddan müvafiq olduqda istifadə edilə bilər. "Karusel" metodunun məqsədi – mövzunun qısa vaxt ərzində interaktiv şəkildə əhatəli araşdırılmasına imkan yaratmaqdır. Bu zaman hər bir tələbə bütün məsələlərin həllində iştirak edir. Metod məntiqi, tənqidi və müstəqil düşünmə bacarığını, fərdi və qrup məsuliyyətini, ünsiyyət qabiliyyətini və qrupdaxili qarşılıqlı əlaqə hisslərini inkişaf etdirir. Metodun mahiyyətini aşağıdakılar təşkil edir: müəllim öyrənilən mövzulara aid Blum taksonomiyasından istifadə edərək bir neçə düşündürücü açıq sual və ya tapşırıq tərtib edir. Müvafiq olaraq auditoriyada tələbələr 3 və ya 4 qrupa bölünür ki, burada hər qrupa 1 suala aid cavab yazmaq tapşırılır. Bu işə təxminən 5 dəqiqə vaxt ayrılır. Tapşırığın yerinə yetirilməsinə ayrılan vaxt bitdikdən sonra, hər qrup öz yazdıqları iş vərəqini saat əqrəbi istiqamətində yanındakı qrupa ötürür. Hər qrup bu iş vərəqlərində olan yazıları nəzərdən keçirir və məsələyə aid öz fikrini ayrı bənddə qeyd edir. İş vərəqləri ilkin qruplara qayıtdıqdan sonra təqdimatlar və onların müzakirəsi başlanır. Yekunda tələbələr mövzu üzrə müəllimin iştirakı ilə ümumiləşdirmələr aparır, nəticə çıxarırlar.

**Venn diaqramı** kəsişən iki və daha artıq çevrə üzərində qurulur. Çevrənin üst-üstə düşdüyü hissədə kifayət qədər yer olmalıdır.

Həmin hissədə sözügedən məsələnin ümumi cəhətləri qeyd olunmalıdır. Venn diaqramı vasitəsilə oxşar və fərqli cəhətləri vermək olar. Bu üsullar öyrənənlərdə düşünmə, analizetmə bacarığı aşılayır, dərsdə fəallığı təmin edir. Beləliklə, müəllim yaradıcı olmalı, tələbələrə dilimizi yaxşı mənimsətmək üçün, ilk növbədə, onu sevdirməli, ana dilimizin gözəlliyini, ahəngdarlığını yeri gəldikcə xatırlatmalıdır.

**Nəticə / Conclusion**

Sintaksisin tədqiqat obyektinə daxil olan cümlənin quruluşca sadə növünün və onun müxtəlif prinsiplər əsasında təsnifinin tədrisi öyrənən tərəfdə nitq vərdişlərinin daha da inkişaf etməsinə, son nəticədə isə Azərbaycan dilinin yaxşı mənimsənilməsinə imkan yaratmış olur. Yeni texnologiyaların tətbiqi, həmçinin öyrənənlərin bacarıq və vərdişlərinin formalaşmasında da müsbət rol oynayır.

Sadə cümlə və onun növlərinin tədrisi prosesində innovasiyaların tətbiqi zamanı mövzunun yaxşı mənimsədilməsi ilə yanaşı, aşağıdakı müsbət cəhətlərə də nail olmaq mümkündür:

1. Müəllim-tələbə müzakirələri zamanı yeni biliklərin üzə çıxarılması hədəflənir;
2. Bu prosesdə tələbə obyekt deyil, subyekt rolunu oynayır;
3. Tədris prosesinə İKT imkanlarının tətbiqi vərdişləri aşılanır;
4. Tələbələrdə internet şəbəkəsindən istifadə vərdişləri formalaşır;
5. Bu prosesdə tələbə kreativ düşüncəyə sahib bir mütəxəssis kimi yetişir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Abdullayev Ə.Z., Seyidov Y.M., Həsənov A.Q. (1972). Müasir Azərbaycan dili. IV hissə. Bakı, Maarif. 476 s.

2. Abdullayev Ə.Z. (1992). Azərbaycan dili məsələləri. Bakı, “Bakı Universiteti” nəşriyyatı. 332 s.
3. Abdullayeva G. (2014). Müasir Azərbaycan dili. II hissə. Bakı, Təhsil. 308 s.
4. Kazımov Q.Ş. (2008). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Nurlan. 500 s.
5. Qədimova X. (2003). İnteraktiv təlim metodları və onların tətbiqi yolları. Bakı.
6. Mehrabov A., Abbasov Ə., Zeynalov Z., Həsənov R. (2006). Pedaqoji texnologiyalar. Bakı, Altunnəşr. 372 s.
7. Nəbiyeva Ş. (2010). Ana dilinin tədrisi metodikasının aktual problemləri. Bakı, ADPU-nun nəşriyyatı. 148 s.
8. Nəzərov A. (2012). Müasir təlim texnologiyaları. Bakı, ADPU-nun nəşriyyatı. 104 s.
9. Veysova Z. (2007). Fəal/interaktiv təlim: müəllimlər üçün vəsait. Bakı, 150 s.

ПРЕПОДАВАНИЕ АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКА И ЛИТЕРАТУРЫ
2023, № 1 (275), 50-62
doi.org/10.48445/g0109-1588-1641-w

**ВОПРОСЫ ЛИНГВИСТИКИ**

# Влияние таджикских заимствований в развитие синхронного словообразования узбекского языка

***Раджаб Хидиров***
Кандидат филологических наук. Таджикский Государственный Педагогический
Университет им. С.Айни. Таджикистан.
E-mail: rajabhidirov@mail.ru
https://orcid.org/0000-0002-3291-7169

**РЕЗЮМЕ**
Взаимодействие и взаимовлияние таджикского и узбекского языков насчитывает многовековую историю. В статье на конкретных примерах было доказано заимствование узбекским языком таджикских аффиксов, префиксов, суффиксов и самостоятельных слов, активно участвующих в словообразовательном процессе узбекского языка. В статье также были представлены 7 типов словообразовательных моделей в узбекском языке с помощью таджикских вспомогательных элементов.

**КЛЮЧЕВЫЕ СЛОВА**
словообразование, узбекский язык, таджикский язык, заимствование, аффикси, префикси, суффикси

**ИСТОРИЯ СТАТЬИ**
отправлено: 25.01.2023
принято: 22.02.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO.1, VOL. 275, 50-62
doi.org/10.48445/g0109-1588-1641-w

**LINGUISTIC ISSUES**

# The influence of words borrowed from the Tajik language in the development of synchronic word formations of the Uzbek language

***Rajab Khidirov***
Candidate of Philological Sciences. Tajik State Pedagogical University named after
S.Aini. Tajikistan. E-mail: rajabhidirov@mail.ru
https://orcid.org/0000-0002-3291-7169

**ABSTRACT**
The interaction and mutual influence of the Tajik and Uzbek languages has a long history. In the article, specific examples were used to prove the borrowing of Tajik affixes, prefixes, suffixes and independent words by the Uzbek language, which are actively involved in the word-formation process of the Uzbek language. The article also presented 7 types of word-formation patterns in the Uzbek language with the help of Tajik auxiliary elements.

**KEYWORDS**
word formation,
uzbek language,
tajik language,
borrowing, affixes,
prefixes, suffixes

**ARTICLE HISTORY**
Received:
25.01.2023
Accepted:
22.02.2023

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 50-62
doi.org/10.48445/g0109-1588-1641-w

D İ L Ç İ L İ K  M Ə S Ə L Ə L Ə R İ

# Özbək dilinin sinxron söz düzəltmələrinin inkişafında tacik dilindən alınma sözlərin təsiri

***Rəcəb Xıdırov***
Filologiya elmləri namizədi. S.Ayni adına Tacikistan Dövlət Pedaqoji Universiteti. Tacikistan. E-mail: rajabhidirov@mail.ru
https://orcid.org/0000-0002-3291-7169

**XÜLASƏ**
Tacik və özbək dillərinin qarşılıqlı əlaqəsi və qarşılıqlı təsiri uzun tarixə malikdir. Məqalədə özbək dilinin söz düzəltmələri prosesində fəal iştirak edən tacik dilinin affiks, prefiks, şəkilçi və müstəqil sözlərin özbək dili tərəfindən qəbul edilməsini sübut etmək üçün konkret misallardan istifadə edilmişdir. Məqalədə həmçinin tacik dilində köməkçi elementlərin köməyi ilə özbək dilində 7 növ söz əmələ gətirmə nümunəsi də təqdim edilmişdir.

**AÇAR SÖZLƏR**
söz düzəltmələri,
özbək dili,
tacik dili, alınma sözlər,
affikslər, prefikslər,
şəkilçilər

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 25.01.2023
qəbul edilib: 22.02.2023

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 77-82
https://doi.org/10.48445/f6706-0887-5957-l

**Q R A M M A T İ K A**

# Nitq inkişafının sintaktik təlimində cümlə və onun tədrisinin rolu

***Fidan Əhmədli***
Magistrant, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: hmdli99@list.ru
https://orcid.org/0000-0002-5914-6026

**XÜLASƏ**
Cümlə – sistem təşkil edən dilin ən mənalı vahidi kimi nitq inkişafında böyük rola malikdir. Onun həm qrammatik, həm də ritorik potensial imkanları olduqca genişdir. Dilin özü kimi onun kommunikativ ifadə vasitəsi olan cümlə də birbaşa təfəkkürlə bağlıdır. Nitqin (dilin) əsas vahidi olan cümlə, təfəkkürdən süzülüb gələn fikrin paradiqmasıdır. Təfəkkür nitqin "istehsal" olunduğu mühərrikdir. Çünki insan düşünərkən də söz və cümlələrdən istifadə edir. Bu səbəbdən nitqin tipi sayılan daxili nitqə *"düşüncə nitqi"* və ya *"fikirləşmə dili"* də deyilir. Cümlə təfəkkürdən doğan anlayışların zahiri strukturudur. Təfəkkürdə əvvəl anlayış, daha sonra bu anlayışın həcminə və strukturuna müvafiq leksik vahid (söz) yaranır, nəticədə ifadə və cümlə əsasında məfhumun işarələnmə prosesi baş verir.

**AÇAR SÖZLƏR**
kommunikativ ifadə, funksional vəzifə, semantik cəhət, predikativlik, sintaktik təlim

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 13.01.2023
qəbul edilib: 22.02.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 77-82
https://doi.org/10.48445/f6706-0887-5957-l

**G R A M M A R**

# The role of the sentence and its teaching in the syntactic training of speech development

***Fidan Ahmadli***
Master student, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: hmdli99@list.ru
https://orcid.org/0000-0002-5914-6026

**ABSTRACT**
The sentence, which is one of the most meaningful units of the language that makes up the system, plays a greater role in the development of speech. Both grammatical and rhetorical potential possibilities of the sentence are quite wide. Like the language itself, the sentence, its means of communicative expression, is directly related to thinking. The sentence, which is the basic unit of speech (language), is the paradigm of the idea filtered through thinking. Thinking is the engine by which speech is "produced". Because a person cannot think without words and sentences even when thinking. For this reason, the inner speech, which is considered a type of speech, is also called the speech of thought, the language of thinking. A sentence is an external structure of concepts born from thinking. In thinking, a concept first arises,

**KEYWORDS**
communicative expression, functional task, semantic aspect, predicativeness, syntactic training

**ARTICLE HISTORY**
Received: 13.01.2023
Accepted: 22.02.2023

then the process of marking the concept takes place based on the lexical unit (word), expression and sentence corresponding to the volume and structure of this concept.

## Giriş / Introduction

Dilin ən böyük vahidlərindən olan cümlənin nitq inkişafındakı rolu danılmazdır. Belə ki, onun həm qrammatik, həm də ritorik potensial imkanları olduqca genişdir. Nəzərə alsaq ki, ünsiyyət vasitəsi olan dil öz kommunikativ funksiyasını cümlə vasitəsilə həyata keçirir, belə olan halda onun funksional vəzifələrinin daha aparıcı olduğu qənaətini tərəddüd etmədən qəbul etmək mümkündür.

“Dildə cümlənin əhəmiyyəti çox böyükdür. Başqa sözlə desək, cümlə dilin özüdür. Cümlənin əmələ gəlməsində dilin demək olar ki, bütün vasitələri, bütün ünsürləri iştirak edir. Çünki cümlə dildə olan və dilçilik elminin müxtəlif sahələrinin (fonetika, leksikologiya, semasiologiya, morfologiya..) tədqiq etdiyi dil faktlarının, müxtəlif dəyişmələrin, rəngarəngliyin yekunudur [1, s.76].

Dilin özü kimi onun kommunikativ ifadə vasitəsi olan cümlə də birbaşa təfəkkürlə bağlıdır. Bu, sintaktik təlimin nitqin inkişaf etdirilməsi prosesində ən vacib məqam kimi öyrənilməsi nəzərdə tutulan məsələlərdəndir. Ümumiyyətlə, sintaksisin tədrisində qarşıya çıxan çətinliklərdən biri də məhz bu problemdir.

İnsan beynində nəyi necə düşünürsə, onu nitq vasitəsilə ifadə edir. Nitqin (dilin) əsas vahidi olan cümlə təfəkkürdən süzülüb gələn fikrin quruluşu, tamamlanmış düşüncənin təzahürüdür. Müəllim nitqin sütunu hesab edilən cümlə ilə əlaqəli nəzəri-qrammatik xüsusiyyətlər haqqında dolğun təsəvvür yaratmaq məqsədilə onu təfəkkürlə müqayisəli tərzdə tədris etməlidir. Təfəkkür nitqin “istehsal” olunduğu mühərrikdir. Çünki insan hətta düşüncələrini belə söz və cümlələrsiz ifadə edə bilmir. Bu səbəbdən nitqin tipi sayılan daxili nitqə *“düşüncə nitqi”* və ya *“fikirləşmə dili”* də deyilir.

Belə bir qənaətə gəlmək mümkündür ki, təfəkkürsüz dil olmadığı kimi, dilsiz də təfəkkür yoxdur. Bu iki anlayış biri digəri ilə dialektik vəhdətdə təzahür edir. Lakin onu da qeyd etmək lazımdır ki, dillə təfəkkürü eyniləşdirmək doğru deyil. Çünki

təfəkkür qanunlarını məntiq, dil qanunlarını qrammatika elmi tədqiq edir. Digər tərəfdən, təfəkkürün quruluşu dünya xalqları üçün eyni olduğu halda, dil milli xarakter daşıyır. Hər bir dil öz daxili norma və prinsipləri əsasında yaranır.

Müəyyən bir anlayış ayrı-ayrı xalqlar üçün vahid şəkildə düşünülsə də, lakin müxtəlif sözlərlə ifadə olunur. Həmin leksik və sintaktik vahidlər xalqın özünəməxsus konkret söz, söz birləşməsi və cümlələrindən ibarət olur. Məntiqi kateqoriya sayılan "hökm", qrammatik kateqoriya hesab edilən "cümlə" ilə bir sıra əlamətlərinə görə ekvivalentlik təşkil edir. Lakin analoji xüsusiyyətlərinə baxmayaraq, bu iki kateqoriya bir-birindən kəskin şəkildə fərqlənir:

a) Məntiqi kateqoriya olan hökmlər struktur-semantik cəhətdən cüttərkibli olduğu halda, qrammatik kateqoriya sayılan cümlə baş üzvlər və ikinci dərəcəli üzvlərdən ibarətdir;

b) Cümlə məntiqə nisbətən daha geniş ifadə imkanlarına malikdir. Belə ki, hökmlərin hamısı cümlə vasitəsilə ünsiyyətə tətbiq edilir. Ancaq bütün cümlələr hökm bildirmir. Yalnız nəqli cümlələrin hökm ifadəetmə qabiliyyəti vardır. Ritorik sual istisna olmaqla, sual və əmr cümlələri bu kommunikativ funksiyadan məhrumdur.

"Görkəmli filosof və dilçilərin qeyd etdiyi kimi, cümlə, yazılı və şifahi nitqdə ünsiyyət silahı, fikir mübadiləsi vasitəsidir. İnsan obyektiv aləm haqqında fikirlərini, bir-birinə demək istədiklərini rabitəli nitqin canlı vahidi olan cümlələr vasitəsilə həyata keçirir. Hər bir cümlə rabitəli nitqin bir pilləsi, bir kəsiyi olub, şifahi nitqdə intonasiya ilə, yazılı nitqdə nöqtə və ya nöqtə hüququnda olan durğu işarələri ilə (sual işarəsi, nida işarəsi, üç nöqtə və s.) sərhədlənir. Biz cümləni mətndən ayırmaqla da mənasını dərk edə bilirik, bu, cümləni təşkil edən sözlərdən alınan mənadır" [4, s.82].

Verilmiş fikrə diqqət etdikdə cümləyə məxsus iki aspektə – struktur və semantik cəhətlərə işarə edildiyinin şahidi oluruq. Görünən detallardan belə qənaətə gəlmək olar ki, cümlə təfəkkürdən doğan anlayışların zahiri strukturu və həmin strukturla formalaşan semantikanın – daxili mənanın təzahürüdür.

Təfəkkürdə əvvəlcə anlayış, daha sonra bu anlayışın həcminə müvafiq leksik vahidlər yaranır ki, onlar da sadə cümlə ilə işarələnir. *Söz* müəyyən anlayışın, *ifadə* quruluşca iki anlayış və məfhumun, *cümlə* isə konkret bir fikrin ifadəsinə olan zərurət nəticəsində meydana gəlir.

Sintaksis təlimdə bu tip problemlərin həlli istiqamətində konkret addımlar atılmalı, praktik nümunələr əsasında bu cür mövzulara aydınlıq gətirilməlidir. Yalnız belə olan halda cümlə nitq inkişafına əhəmiyyətli töhfə ola bilər.

Təfəkkürdən doğan məfhum və anlayışların tam mənası ilə ifadəsi üçün cümləyə xas bir sıra əlamətlərin də öyrənilməsi vacib məsələlərdən hesab edilir. Bu, nitqin düzgün və sağlam ifadəsi, müsahiblə pozitiv kommunikasiyanın qurulması işində vacib amillərdəndir. Əslində cümləni nitqin müstəqil elementinə çevirən də məhz həmin amillərdir. Cümləni formalaşdıran xüsusiyyətlər aşağıdakılardır:

1. Fikir bitkinliyi;
2. Bitmə intonasiyası və modallıq;
3. Predikativlik.

Dilçilik ədəbiyyatında və dilçilər arasında cümləyə məxsus birinci əlamət – fikir bitkinliyi mübahisə obyekti olmuşdur. “Fikir özü fəlsəfi kateqoriya olduğu üçün geniş anlayışdır. Ona görə də bu anlayışın bir söz və ya bir cümlədə tamamlanması absurd səciyyə daşıyır” [5, s.28]. Qeyd edək ki, cümlədə ifadə edilən fikir, nitqin (mətnin – yazılı nitqdə) sadəcə müəyyən hissəsinin ifadə vasitəsidir. Konkret fikrin ifadəsi isə mətn əsasında mümkündür.

“Nitqdə adətən daha çox elə cümlələr işlənir ki, onları ümumi nitq axınından ayırdıqda “fikir bitkinliyi” haqqında söhbət ola bilməz. Xüsusən, tərkibində müxtəlif əvəzliklər olan cümlələr bir qayda olaraq bitmiş fikir ifadə etmir. Deməli, fikir hər cür cümlədə deyil, yalnız ümumiləşmiş hökmləri ifadə edən cümlələrdə bitmiş

olur. Əslində fikir cümlədə deyil, abzasda, bir neçə abzas toplusunda, bir fəsildə, bütöv bir əsərdə bitmiş olur" [2, s.325].

Abzasları məzmun baxımından müqayisə etdikdə onlar arasındakı fərqi məzmun bitkinliyinə əsasən müəyyən etməyin mümkün olduğunu görə bilərik. Dahi şair Nizami Gəncəvi özünün ədalətli şah haqqında olan fikirlərini məhz "Xəmsə"si ilə ifadə etmişdir. Bəzi araşdırmaçılar "bitmiş fikir" ifadəsini "ayrıca (alınmış) fikir" anlayışı kimi də adlandırırlar.

Əslində cümləyə məxsus birinci əlamət məntiqi cəhətdən səhv, qrammatik baxımdan düzgündür. Məntiqi aspekt məqalənin əvvəlində izah edildi, indi isə qrammatik cəhətləri özündə ehtiva edən modallıq və predikativlik haqqında subyektiv münasibətimizi bildirək:

a) Modallıq – müəyyən fikrə münasibət bildirmə vasitəsidir. İstənilən cümlədə məzmunundan asılı olaraq informativ və ekspressiv münasibət ifadə edilə bilər. Modallıq ünsiyyətin ünvanına yönəlmiş və onun formalaşmasını (tənzimlənməsini) təşkil edən vasitədir. Əslində intonasiya kimi modallıq özü də cümlənin funksional tiplərinin əmələ gəlməsində iştirak edir. Cümlənin bu tiplərində (əmr, sual, nəqli, nida) intonasiya münasibətləri dominantlıq təşkil edir.

b) Predikativlik – varlıq haqqında müəyyən məlumat bildirmə vasitəsidir. Bu kateqoriya daha geniş semantik həcmə malikdir. Zaman, şəxs, modallıq, intonasiya predikativlikdə vəhdət təşkil edir. O, fikrin bitmə və tamamlayıcı vasitəsidir. Nitqin rəvan, aydın və səlis ifadəsi onun predikativliyi ilə bilavasitə bağlıdır. Fikrin şəxs və zaman baxımından aparıcı olması, münasibət (modallıq) və bitmə intonasiyası (tamamlayıcı) istiqamətində mükəmməl təqdimi birbaşa olaraq predikativliyin kommunikativ funksiyasının təzahürüdür.

Nitqin daxili simasını – semantik məzmununu hədəfə yönəldən cümlə fikrin ədəbi komponenti hesab edilir. Cümlədə funksional strukturlar aktivləşdikcə mənanın funksional dəyişməsi də qaçılmaz olur. Bu semantik hadisə cümlə komponentini təşkil edən leksik vahidlərin, məfhum və anlayışların emosional və informativ

çalarlığının ifadəsi nəticəsində baş verir. “Yeni əşya köhnənin gördüyü funksiyanı yerinə yetirir, ona görə də sözdə funksional dəyişmə baş verir. Hər xalqın maddi mədəniyyət tarixində elə hallar olur ki, bu və ya digər vəzifəsi olan əşya sıxışdırılıb sıradan çıxarılır, lakin onun vəzifəsi qalır, bu vəzifəni başqa əşya verməli olur. Odur ki, həyatda tərk olunmuş əşyanın adı başqa əşyaya verilir. Sözün mənasında funksional dəyişiklik əmələ gəlir” [3, s.174].

Nitq məzmunca dolğun olmalıdır. Onun ədəbi komponenti olan cümlə struktur cəhətdən nitq normalarına müvafiq qurulmaqla yanaşı, semantik füsunkarlığa da malik olmalıdır. Bu iki aspekt biri digərini tamamladıqda onun kommunikativlik funksiyası maksimum həddə çatmaqla nəticələnir.

## Nəticə / Conclusion

Cümlədəki fikrin struktur və semantik cəhətdən bütövləşib konkret hədəfə yönlənməsində məna və sintaktik əlaqələrin rolu əvəzedilməzdir. Bu isə bütövlükdə nitqin (dilin) forma ilə məzmununun dialektik vəhdətdə olmasının təzahürüdür. Real həyatda əşya və hadisələrin münasibət və əlaqələri rəngarəng olduğu üçün söz birləşməsi və cümlədəki sözləri bir-biri ilə bağlayan məna əlaqələri də müxtəlif olur: 1) subyektiv; 2) obyektiv; 3) atributiv; 4) relyativ.

Onlar arasındakı əlaqələrin ikinci cəhətini sintaktik əlaqələr (tabesizlik, tabelilik) təşkil edir. Yuxarıda bəhs etdiyimiz predikativlik əlaqələri xəbərlə mübtədanın uzlaşması fonunda təzahür edir ki, bu da nitqin inkişafında vacib amillərdən hesab edilir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Abdullayev Ə., Seyidov Y., Həsənov A. (2007). Müasir Azərbaycan dili. Bakı, Şərq-Qərb. 422 s.
2. Adilov M. (2020). Əsərləri IX. Bakı, Elm və təhsil. 430 s.
3. Adilov M., Verdiyev Z., Ağayeva T. (2019). Azərbaycan dilinin semasiologiyası. Bakı, Elm. 304 s.
4. Kazımov Q. (2010). Müasir Azərbaycan dili (sintaksis). Bakı, Elm və təhsil. 500 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 83-90
doi.org/10.48445/o4084-9105-9596-g

**Q R A M M A T İ K A**

# Bədən üzvləri ilə bağlı olan frazeoloji birləşmələr

***Tərlan Abdullayeva***
Magistrant, Bakı Avrasiya Universiteti. Azərbaycan.
E-mail: abdullayevaterlan7@gmail.com
https://orcid.org/0000-0002-2027-301X

**XÜLASƏ**
Dildəki frazeoloji birləşmələri öyrənən Frazeologiya elmi dilçiliyin müstəqil şöbəsi kimi dilin xüsusi təbəqəsini təşkil edir. Bu birləşmələrin tarixi kökləri qədim dövrlərə dayansa da, onun müstəqil bir elm kimi inkişafı XX əsrin əvvəllərindən başlamışdır. Frazeologiyanın bir elm kimi tədqiqi tarixi isveçli dilçi alim Ş.Ballinin adı ilə bağlı olsa da, linqvistik inkişafın öyrənilməsi tarixi rus dilçiliyi ilə əlaqəli olmuş, bu haqda çox sayda elmi əsərlər, həmçinin tədqiqat xarakterli məqalələr yazılmışdır. Dilin zənginləşməsində frazeoloji birləşmələrin xüsusi əhəmiyyəti vardır. Bu vahidlər dilin lüğət tərkibinin ayrılmaz və zəngin xüsusiyyətə malik qatını təşkil edir. Məqalədə bədii ədəbiyyatda istifadə edilən bədən üzvləri ilə bağlı frazeoloji birləşmələr araşdırılmış və verilən nümunələr əsasında tədqiqata cəlb edilmişdir.

**AÇAR SÖZLƏR**
dilçilik, frazeoloji birləşmələr, bədən üzvləri, somatik ifadələr, bədii ədəbiyyat

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.01.2023
qəbul edilib: 26.02.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 83-90
doi.org/10.48445/o4084-9105-9596-g

**GRAMMAR**

# Phraseological combinations related to body parts

***Tarlan Abdullayeva***
Master student, Baku Eurasian University. Azerbaijan.
E-mail: abdullayevaterlan7@gmail.com
https://orcid.org/0000-0002-2027-301X

**ABSTRACT**
Phraseology, which studies phraseological combinations in the language, constitutes a special layer of the language as an independent branch of linguistics. Although the historical roots of these compounds date back to ancient times, its development as an independent science is considered to be from the beginning of the 20th century. Although the history of the study of phraseology as a science began with the Swedish linguist S. Balli, the history of the study of linguistic development was related to Russian linguistics, and many scientific works and research articles were written in this regard. Phraseological combinations have a special importance in the enrichment of the language. These combinations form an integral and rich feature layer of the vocabulary of the language. In the article, phraseological combinations related to body parts used in fiction were investigated and

**KEYWORDS**
linguistics, phraselogical units, body parts, somatic expressions, belles-lettres

**ARTICLE HISTORY**
Received: 05.01.2023
Accepted: 26.02.2023

## Giriş / Introduction

Frazeologiya (yun. *phrasis* – ifadə, *logos* – təlim) – dildəki frazeoloji birləşmələri geniş mənada öyrənən dilçiliyin müstəqil bir şöbəsidir. Bu ifadələr xalqın həyat və məişətini, tarixi keçmişini, adət və ənənələrini, müdrikliyini, milli psixologiyasını aydın və parlaq şəkildə əks etdirir.

Frazeoloji birləşmələr tərkibcə dəyişməz, bütövlükdə məcazi mənanı ifadə edən sabit söz birləşmələridir. Bu birləşmələrdə sözlər üzvi surətdə elə birləşir ki, onları bir-birindən ayırmaq, birini digəri ilə əvəz etmək və hər bir sözü müstəqim mənada düşünmək mümkün olmur. Bu mənada, komponentlərin bir-birinə mənaca yaxın və ayrılmaz olması frazeologizmlərin sabitliyini göstərir. Frazeologizmlər özlərinin kommunikativ ifadə zənginliklərini saxlamaqla getdikcə saflaşır, obrazlılığı, ekspressivliyi, ifadəliliyi artırmaqla nitqin səlisliyini, emosionallığını təmin edir. Onların izahı tərkib üzvlərinin mənaları əsasında deyil, bütövlükdə müəyyənləşir. Belə ki, bu cür birləşmələrin mənalarını forma və məzmun vəhdəti baxımından yanaşmaqla açmaq mümkündür.

Frazeoloji birləşmələr məzmun müxtəlifliyinə görə seçilir: dini yaşam tərzi və adət-ənənələrlə bağlı yaranan frazeologizmlər; alqış səciyyəli frazeologizmlər; etik-davranış səciyyəli frazeologizmlər və s. Bu birləşmələrlə yanaşı, bədii ədəbiyyat nümunələrində bədən üzvləri ilə bağlı frazeoloji ifadələrə də rast gəlmək mümkündür. Belə ki, şifahi xalq ədəbiyyatının ən qədim yazılı abidəsi olan "Kitabi-Dədə Qorqud" dastanında da bu cür ifadələr xüsusilə diqqət cəlb edir. Əsərdə təpə (baş), ağız, alın, ayaq, ənsə, sümük, göz, qarın, qaş, talu (qabırğa), dırnaq, saç və s. bədən üzvləri ilə bağlı somatik ifadələr işlədilmişdir.

**Başına (qəza) gəlmək:**

*Əzəldən yazılmasa, qul başına qəza gəlməz* [12, s.31].

*Başına iş gəldi, yoldaş deyərəm* [12, s.8].

**Başına çıxmaq– ağlını aparmaq:**
*Şərabın istisi başına çıxdı* [12, s.95].

**Ağız açmaq:**
*Ağız açıb ögər olsam, üstümizdə tənri görkli* [12, s.39].

**Ağzının suyu axmaq:**
*Avsal olmış tana kibi ağzının suyu aqdı* [12, s.87].

**Ayağına düşmək:**
*Cübbəsilə-çuxəsilə Beyrəgin ayağına düşdi* [12, s.65].

**Bağrı yanmaq:**
*Yandı bağrım, göynədi içim* [12, s.61].

*Yalnuzca oğul görünməz bağrım yanar* [12, s.72].

**Ğafil baş:**
*Ğafil baş ağrısın beyni bilür* [12, s.32].

**Belim qüvvəti:**
*Tutar belim qüvvəti oğul* [12, s.66].

**Çatma qaşlı:**
*Qurulu yaya bənzər çatma qaşlum* [12, s.35].

**Başa qaxınc qaxmaq:**
*Əgər çobanla varacaq olursam, Qalın Oğuz Bəgləri mənim başıma qaqınc qaxarlar* [12, s.46].

**Bağır basmaq:**
*Dəlü ozan gəldi; baş endirdi, bağır basdı, salam verdi* [12, s.63].

**Alnına çıxmaq – sərxoş olmaq:**

*İçüb-içüb Ulaş oğlu Salur Qazanın alnına şərabın istisi çıqdı* [12, s.42].

Verilmiş nümunələrdən aydın görünür ki, bədən üzvləri ilə bağlı frazeoloji ifadələr şifahi xalq ədəbiyyatının ən qədim nümunəsi olan "Kitabi-Dədə Qorqud" dastanında üstünlük təşkil etmişdir. Bu tip ifadələrə poetik dilin lüğət tərkibində daha sıx formada rast gəlinir. Belə ki, "Azərbaycan dilinin izahlı lüğəti"ndə "baş" və "əl" sözləri ilə əlaqəli 200, "qulaq", "ayaq", "ağız" sözləri ilə əlaqəli 100-ə yaxın, "göz"lə 300-dən çox, "dil" sözü ilə bağlı 100-dən artıq somatik ifadələr verilmişdir.

**Qol-qanad açmaq; əlləri qoynunda qalmaq:**

*Hamı uca tutsun insan adını,*
*Qoy qəlbi qaralar yanıb yaxılsın.*
*Yaxşılıq açanda qol-qanadını,*
*Yamanlıq əlləri qoynunda qalsın* [3, s.4].

**Gözünün altına almaq; gözüm üstə yerin var; üzü ağ etmək:**

*Mən də gedəsiyəm, ay ana torpaq*
*Nakam taleyim də qorxutmaz məni.*
*Necə ki, arzumda axan kürün var*
*Gözümün altına almışam səni*
*Ölsəm də, gözümün üstə yerin var* [4, s.5].

*Sən sönməyə qoymadın babaların odunu,*
*Üzün ağ olsun, oğul, üzümü ağ elədin* [4, s.5].

**Qapının ağzını kəsdirmək:**

*Dedin ömrümüzün odu bir qarış,*
*Yüz ocaq söndürür bəzən bir ömür.*
*Vallah, gözümüzü açıb yumunca,*
*Qapının ağzını kəsdirir ölüm* [4, s.5].

**Üzə vurmaq; üzə gülmək; üzə durmaq:**

*Bəlkə, min suçumu bilmisən mənim,*
*Birini üzümə vurmamısan heç.*
*Eyhamla üzümə gülmüsən mənim,*
*Bircə yol üzümə durmamısan heç* [7, s.84].

**Ağızdan söz qapmaq:**

*İkrahla seyr edirəm kişi donluma yani*
*Ağızlardan söz qapıb ovuclara qoyanı* [4, s.7].

**Qaşla göz arasında olmaq:**

*Ömrə bel bağlama, ömür əzəldən*
*Amana bənd olub, aman, ay aman!*
*Ölüm qaşnan gözün arasındadır*
*Yaxşıya yaxşı ol, yamana yaman!* [4, s.8]

**Belinə yaraq olmamaq:**

*Heç kimin payına ortaq deyiləm,*
*Heç kimin belinə yaraq deyiləm,*
*Heç kimin başına daraq deyiləm,*
*Heç kimin önündə qatlanmaz dizim.*

*Mən ki durmuşam öz kököm üstə*
*Kimə neynəmişəm, a canım, gözüm,*
*Mən ki dolanıram öz tüküm üstə,*
*Özüm çıxarıram sudan çulumu,*
*Bəs niyə kəsirlər mənim yolumu* [4, s.8-9].

**Burnun ucu göynəmək:**

*Könül nə danışır, könül nə deyir,*
*Gəlib-gedənlərin həsrəti canda.*
*Necə də burnumun ucu göynəyir,*
*Köhnə kişiləri xatırlayanda* [4, s.30].

*Məsləksiz adam var, yaşar birtəhər*
*Yoxdur ki, tapıla üz bişərəfdə.*
*Tərəzi gözünə girsə tərəflər*
*O, quyruq bulayar ağız tərəfdə* [4, s.28].

*Nə qədər ümidin toxundu daşa,*
*Nə qədər istəyin gözündə qaldı.*
*Bədənin torpaqda daldalansa da,*
*Döyünən ürəyin sözündə qaldı* [4, s.28].

*Ay usta, o daşı hörmə binaya,*
*Gözüm su içməyir o daşdan, deyim.*
*...Bir daşı quyuya salır bir dəli, –*
*Kar aşmaz sonrakı fəsaddan, deyim,*
*Usta, göz qoyursan beləlarinə,*
*Üzməyi bacarmır – gedir dərinə.*
*Burnundan uzağı görə bilməyir,*
*Dərsi alimlərə vermək istəyir* [4, s.34].

Azərbaycan ədəbiyyatında qadın şairlərinin dilində də somatik frazeoloji ifadələrə rast gəlinir. XX əsr ədəbiyyatımızın görkəmli nümayəndələrindən biri olan Mirvarid

Dilbazi yaradıcılığından verilmiş aşağıdakı misralar bunun bariz sübutudur. **“Əl” sözü ilə bağlı somatik frazeoloji ifadələr:**

*Əlin işdən-gücdən soyuyan zaman*
*Qoymaz səni özgə mərhəmətinə* (M.Dilbazi).

*“Oyan, qəhrəmanım! Yurd əldən gedir”* (M.Dilbazi).

*Bu yükləri çəkmir sinə,*
*Gəl, məndən əl götür, ey qəm!* (M.Dilbazi)

**“Bağır” sözü ilə bağlı somatik frazeoloji ifadələr:**

*Lalənin bağrı yandı, təzədən* [12, s.64].

*Yaşadıqca cavanlana, enlənə,*
*Bir hicabda, bir pərdədə əylənə,*
*Nitqü nəfəsindən canlar dinlənə,*
*Şirin danışıban xoş gülən gərək* (M.P.Vaqif).

*Basaydı üzümə gül ayağını,*
*Öpəydim üzünü, həm dodağını,*
*Gah açaydım ağ sinənin bağını,*
*Qoynundakı qoşa narı görəydim* (M.P.Vaqif).

## Nəticə / Conclusion

Azərbaycanda keçən əsrin ikinci yarısından başlayaraq frazeoloji axtarışlar yüksək nəzəri səviyyədə aparılır. Bir sıra özünəməxsus konsepsiyalar yaradılmasına baxmayaraq, Azərbaycan dili frazeologiyasının bir sistem kimi öyrənilməsinə hələ də ehtiyac duyulur.

Müşahidə etdiyimiz kimi, somatik tipli frazeoloji birləşmələr bədii ədəbiyyatımıza, həmçinin şifahi xalq ədəbiyyatına xüsusilə rəng qataraq ona obrazlılıq və canlılıq verir. Bütün bunları nəzərə alaraq deyə bilərik ki, Azərbaycan dilçiliyində frazeologiya

nəzəriyyəsinin inkişaf tarixinin hərtərəfli aspektdə öyrənilməsi aktual xarakter daşıyır. “Bədən üzvləri ilə bağlı olan frazeoloji birləşmələr” mövzusunun araşdırılması da, məhz bu səbəbdən irəli gəlmişdir.

## İstifadə edilmiş ədəbiyyat / References


1. Araslı H. (2004). Molla Pənah Vaqif. Əsərləri. Bakı, Şərq-Qərb. 269 s.
2. Arif H. (1985). Seçilmiş əsərləri. İki clddə. Bakı, Yazıçı. I c., 408 s., II c., 251 s.
3. Azərbaycan dilinin izahlı lüğəti. (2006). Dörd cilddə, I cild. Bakı, Şərq-Qərb. 239 s.
4. Hüseynov M. (2013). Poetik frazeologiya. Bakı, Elm və təhsil. 166 s.
5. Xəlil R. (1989). Hara gedir bu dünya. Bakı, Yazıçı. 230 s.
6. Kəmərli A. (1984). Ömrümə düşən işıq. Bakı, Gənclik. 152 s.
7. Kəsəmənli N. (1988). Hamısı sevgidəndir. Bakı, Gənclik. 220 s.
8. Kürçaylı Ə. (1980). Ülkər. Bakı, Yazıçı. 236 s.
9. Məmməd İ. (1983). Döyüş, qələbə. Bakı, Yazıçı. 229 s.
10. Sadıq F. (1985). Məndən soruşsalar. Bakı, Yazıçı. 326 s.
11. Vahabzadə B. (1987). Axı dünya fırlanır. Bakı, Yazıçı. 208 s.
12. Zeynalov F., Əlizadə S. (1988). Kitabi-Dədə Qorqud. Bakı, Yazıçı. 265 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 91-97
doi.org/10.48445/q9909-3825-0683-v

**Q R A M M A T İ K A**

# Arxaizmlərin semantikasında baş verən dəyişmələr

***Rəvanə Qasımova***
Magistrant, Bakı Avrasiya Universiteti. Azərbaycan.
E-mail: alirevis23@gmail.com
https://orcid.org/0000-0003-2684-4116

**XÜLASƏ**
İstənilən dövrün tarixi inkişaf mərhələsində sözlərin mənasında baş verən dəyişiklikləri fərqləndirmək üçün arxiv materiallarının və antik dövrün ədəbi-bədii abidələrinin leksik tərkibinə diqqət yetirmək lazım gəlir. Arxaik sözlər dilçilik nöqteyi-nəzərincə ən maraqlı lüğət vahidlərindəndir. Bu sözlər, həmçinin dilin lüğət tərkibinin ən qədim, alt təbəqəsini təşkil edir. Leksikonumuz üçün qiymətli nümunələr olan arxaizmlər dilin fonetik, qrammatik, eyni zamanda leksik xüsusiyyətlərini özündə birləşdirir. Məqalədə verilən nümunələr əsasında arxaizmlərdə məna daralmasına və genişlənməsinə diqqət çəkilir.

**AÇAR SÖZLƏR**
arxaizmlər, semasiologiya, sözün mənası, məna genişlənməsi, məna daralması

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 09.01.2023
qəbul edilib: 25.02.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 91-97
doi.org/10.48445/q9909-3825-0683-v

**GRAMMAR**

# Changes in the semantics of archaisms

***Ravana Gasimova***
Master student, Baku Eurasian University. Azerbaijan.
E-mail: alirevis23@gmail.com
https://orcid.org/0000-0003-2684-4116

**ABSTRACT**
To see the changes in the meaning of words in historical development, it is necessary to pay attention to the lexical composition of materials and literary and artistic monuments of antiquity. Archaic words make up an interesting and ancient layer of vocabulary. These words, combining phonetic, grammatical, and sometimes at the same time lexical features of the language, are very valuable for our lexicon. In order to know the changes in words in historical development, it is necessary to correctly understand the examples of antiquity. In archaisms, attention is drawn to the narrowing of meaning and the expansion of meaning, as can be seen from the examples.

**KEYWORDS**
archaism, semasiology, word meaning, meaning expansion, meaning narrowing

**ARTICLE HISTORY**
Received: 09.01.2023
Accepted: 25.02.2023

## Giriş / Introduction

Təfəkkürün ifadə vasitəsi olan dil, ictimai hadisə olub, cəmiyyətin, siyasi əlaqələrin dəyişməsi, həmçinin elm, texnika və mədəniyyətin inkişafını özündə ehtiva edir. Bu səbəbdəndir ki, dilimizin lüğət tərkibi olduqca zəngindir. Onda xalqın tarixi, adət-ənənələri əks olunur. Belə ki, cəmiyyətin iqtisadi, siyasi, ictimai-mədəni həyatındakı inkişafla əlaqədar olaraq dilin leksik tərkibinin zənginləşməsinə zəmin yaranır, bu isə, köhnəlmiş və yeni sözlər arasında rəqabətə səbəb olur. Nəticədə, köhnəlmiş sözlər dilin leksik tərkibindən çıxaraq, öz yerini yeni sözlərə verir. Beləliklə, baş verən bütün bu dəyişikliklər dilin leksikasında təcəssüm olunur.

Leksikanın dəyişməsi bu proseslərin qarşılıqlı əlaqəsi, dilin lüğət tərkibinə yeni sözlərin əlavə edilməsi və zənginləşməsi ilə bağlıdır. Dildən köhnəlmiş sözlərin çıxması, əvəzində yeni sözlərin əmələ gəlib möhkəmlənməsi uzun və tarixi bir prosesdir. Dilin lüğət fondunda müşahidə olunan dəyişikliklər yalnız yeni sözlərin əmələ gəlməsi ilə nəticələnmir, həm də köhnəlmiş sözlərin aktiv lüğət ehtiyatından çıxmasına səbəb olur. *“Bir dövrün leksik sistemi başqa bir dövrün leksik sistemindən fərqlənir. Eyni məfhumun müxtəlif sözlərlə ifadəsi hər iki dövrdə qala bilər, lakin dövrlərin leksik sistemlərində fərqlənmə ondadır ki, bir dövrdə işlək olmayan sözlər başqa sözlər vasitəsilə sıxışdırılıb arxaikləşə, ya da həmin söz başqa bir dövrdə yeni mənalı yeni söz kimi işlək sözə çevrilə bilər”* [3, s.252].

Dilimizin lüğət tərkibindəki sözlərin bir qismi zamanla işləkliyini itirərək çox az istifadə olunur. Fəal işləkliyi olmayan belə sözlər *köhnəlmiş sözlər* adlanır. Professor Buludxan Xəlilov bu cür sözlərin müəyyən olunması haqqında yazır: *“Köhnəlmiş sözlər müəyyənləşərkən əsas meyar dilin müasir vəziyyətidir. Dilin müasir vəziyyəti hər hansı sözün köhnəlməsini üzə çıxarır. Köhnəlmiş sözlər müəyyənləşərkən tarixilik prinsipindən istifadə olunur. Məsələn: XIX əsrdə işlənmiş yüzbaşı, girov, yasavul və s. sözlər hazırkı dövrdə köhnəlibdir”* [4, s.315].

Köhnəlmiş sözlər iki yerə bölünür:

1. Tarixizmlər;
2. Arxaizmlər.

Dövlət quruluşunun dəyişməsi, əmək prosesinin təkmilləşməsi ilə əlaqədar yaranan sözlər *tarixizmlər* adlanır. Tarixizmlərdə anlayış da, onu ifadə edən söz də köhnəlir. *Arxaizm* sözünün mənası "qədim" deməkdir. Burada söz özü işləkliyini itirsə də, onların əvəzinə həmin mənanı verən başqa sözlər yaranır. Deməli, anlayış qalır, onu ifadə edən söz isə dəyişir, yəni arxaikləşir.

Dilin lüğət tərkibinə daxil olan sözlər müəyyən *leksik* mənaya malikdir. Bu sözlər dilin *semantik* sistemini yaradır. Dilin semantik sistemindən bəhs edən dilçilik şöbəsi *semasiologiya* adlanır. *"Semasiologiya"* yunan mənşəli söz olub, *"semasio"* ifadə etmək, *"loqos"* nəzəriyyə deməkdir. Buradan belə nəticəyə gəlinir ki, semasiologiya sözün mənası haqqında elmdir. Bu elm dilin leksik-semantik sistemini, sözün daxili cəhətini, mənaca genişlənməsi və daralmasını, sözlərin məna qruplarını, məfhum və məna münasibətlərini öyrənir.

Tarixi inkişaf prosesində sözlərin mənasında baş verən dəyişiklikləri fərqləndirmək üçün qədim dövrlərə aid materialların, ədəbi-bədii abidələrin *leksik* tərkibinə nəzər yetirilməlidir. Məna dəyişimini bilmək tarixi abidələrin dilini düzgün anlamaq üçün zəruridir. Sözün mənaca dəyişməsindən danışarkən iki cəhəti fərqləndirməliyik:

- yeni mənanın yaranma səbəbi;
- yeni mənanın yaranma üsulu.

Sözdə yeni mənanın yaranması səbəbi dilin özü ilə bağlı olmayan, *dilxarici* faktor kimi cəmiyyətin ehtiyacı nəticəsində yaranmışdır. Sözdəki yeni mənanın yaranma üsulu isə hər bir dilin daxili qanunlarına, onun sisteminə məxsus xüsusiyyətlərlə əlaqədardır.

Tarixi-ictimai faktorların təsiri ilə yaranan yeni əşya və hadisələri müvafiq şəkildə adlandırmaq zəruriyyəti meydana çıxır. Bunun üçün müxtəlif üsullardan istifadə edilir ki, bunlardan biri də sözün yeni mənada işlədilməsidir. Dildə mövcud olan sözlərin müəyyən əlaqə əsasında yeni anlayışları bildirməsi hadisəsi *semantik derivasiya* adlanır. Meydana çıxmış *yeni* anlayış ilə dildə *əvvəlcədən mövcud olan* anlayış arasında müəyyən *assosiativ* əlaqə yaratmaqla sözlərin mənası genişləndirilə bilər. Yaranan bu mənalar yeni meydana çıxan əşya və hadisələri adlandırmaqla əlaqəlidir. Lakin bu, hər zaman belə deyil, bəzən də mövcud əşya və hadisələri ekspressiv şəkildə adlandırmaq zərurəti ilə əlaqədar olur. Bu proses müxtəlif şəkildə baş verə bilər.

Beləliklə, dildə semantik dəyişmələrin iki başlıca (dildaxili və dilxarici) səbəbi vardır ki, onları şərti olaraq fərqləndirmək lazım gəlir. Qeyd edək ki, mahiyyətcə adlandırmanın özü də elə fərqləndirmədir.

Semantik dəyişmələrin başlıca dilxarici səbəbi predmet və hadisələrin dəyişməsidir. Bundan başqa, o dildə danışanların tərkibində baş verən dəyişmələr də sözün mənasının dəyişməsinə təsir edir ki, bu da dilxarici səbəblərdəndir. Bu halda real həyatda dəyişmənin təsiri olmur, ya da heç bir dəyişmə baş vermir. Cəmiyyətə miras qalmış bəzi dil ənənələri isə yenilənir, dəyişilir. Sözün mənasının dəyişməsi üç formada müəyyən edilmişdir: *məna genişlənməsi, məna daralması və məna köçürülməsi.*

1*. Məna genişlənməsi*. Bu termin sözün *adlandırma* funksiyasının genişlənməsidir. Söz və ya söz birləşməsi dar ixtisas və ya xüsusi terminoloji mənanı deyil, ümumxalq dilində işlək olan ümumi ədəbi dilə məxsus məna kəsb edir. Məsələn, riyaziyyata məxsus "mənfi" və "müsbət" terminlər mənaca genişlənmişdir: "Mənfi təsir oyadır", "Müsbət münasibət bəsləyir".

Müxtəlif sənət, peşə, məşğuliyyət forması və s. ilə əlaqədar söz və ifadələrin ümumxalq danışıq dilinə keçməsi həmin vahidlərin mənaca genişlənməsini əks etdirir. Professor Musa Adilov yazır: *"Qədim abidələrdə işlənən "göy" sözünün müasir dildə mənaca genişləndiyini görürük. Gültəkin abidəsində (VII-VIII əsrlər) "səma" mənasında "göy" yox, tanrı ("manpi") işlənir. M.Kaşğarinin lüğətində (XI əsr) "göy" sözü həm rəng, həm də səma mənasında təsbit olunmuşdur ki, bu ikinci məna sonradan kəsb edilmişdir. Müasir dilimizdə bu söz daha bir məna ("göyərti") qazanmışdır"* [1, s.127].

2. *Məna daralması*. Bəzən "məna daralması" əvəzinə, *məna xüsusiləşməsi* termini də işlənə bilir. Tarixi inkişaf prosesində söz əvvəlki mənalarından birini, yaxud bir neçəsini tərk edir və ya ümumxalq dilindən alınıb *terminoloji* sistemə daxil edilir. Hər iki hal sözün mənaca daralmasına səbəb olur və bunlar mənanın *tarixi* və *texniki* cəhətdən daralması adlanır.

**Aş** – *yemək, xörək.* Bu söz "Kitabi-Dədə Qorqud" dastanında ümumən "*hər cür yemək"* mənasında işləndiyi halda, müasir Azərbaycan dilində, əsasən, bir yemək növü kimi işlədilir. "Aş" sözü qədim türk yazılarında *yemək*, digər mənada isə *qurbanlıq yeməyi* mənasında işlədilmişdir. Bu sözü Suli Fəqihin "Yusif və Züleyxa" poemasında qeydə alan S.İbrahimov ona digər yazılı abidələrimizdə də rast gəldiyini vurğulamışdır. Tədqiqatçının "aş" sözü ilə bağlı aşağıdakı fikri də diqqəti cəlb edir: "Maraqlıdır ki, tədqiqat obyekti kimi götürdüyümüz "Yusif və Züleyxa" poemasının dilində "plov" mənasında *"bəyazlu aş"* sözü işlənmişdir. Ərəb mənşəli söz olan *"bəyaz"*– ağ rəng, -lı[4] isə adlardan sifət düzəldən şəkilçidir. Məsələn: *Dekdi önlərinə həm bəyazlu aş.*

Bu faktlar onu göstərir ki, "aş" sözünün semantikasındakı dəyişiklik məna daralması istiqamətində getmiş, müasir dilimizdə ancaq yeməyin bir növü plov mənasını qoruyub saxlamışdır. Bununla yanaşı, qeyd etmək lazımdır ki, "aş" sözünün frazeoloji birləşmələrin tərkibində *yemək* mənasında işlənməsi faktını müşahidə edirik: *aşına zəhər qatmaq, aşına soğan doğramaq* və s.".

***Ər*** *– kişi, adam*. Qədim türk dillərinə dair yazılı abidələrdə “ər” sözünə “ərən” şəklində *kişi* mənasında rast gəlmək mümkündür. Məşhur şair Qazi Bürhanəddinin dilində işlənən bu söz öz semantik mənasını qoruyub saxlamaqla, “ər”, “ərən” mənalarında geniş istifadə edilmişdir.

Mahmud Kaşğaridə *“ər”* sözü *kişi*, *adam* mənalarında verilir. Məsələn, “Ənqa ər”, yəni “lazımsız adam”, “yönsüz kişi”.

*“Ər”* sözünün *kişi*, *adam* mənalarında işlədilməsinə “Kitabi-Dədə Qorqud” və başqa yazılı abidələrdə də təsadüf olunur. Məsələn: Evinə yazıdən-yabandən bir udlu qonaq gəlsə, ər adam evdə olsa, ona desə ki, tur övrət, ətmək gətir yeyəyin;

*Ər* yigit qayda ürkər ürkülərdən?
Yaxşı at bəlinləməz ilkülərdən.
Düşmənlər bizdə bolsa ditrəşsünlər,
Qağan aslan qaypınmaz dilkülərdən.

Nəsiminin dilində “ər” sözü kişi mənasında işlənmişdir: “Həqq onu *ər* yaratdı, yoxsa dişi?”. Müasir dövrümüzdə “ər” sözünün mənası daralaraq, yalnız *“həyat yoldaşı”* anlamında istifadə olunur.

M.Füzulinin dilində işlənən “inqilab” sözü hər hansı dəyişikliyi bildirir:

Məni qərarım ilə qoymaz oldun, ey gərdun,
Yeridir ahım ilə versə *inqilab* sana.

Bu söz müasir dildə mənaca xüsusiləşərək, siyasi termin səciyyəsi kəsb etmişdir. Mütəmadi olaraq dildəki ümumi sözlər xüsusiyə və ya əksinə çevrilir. Bu hal insan təfəkküründə *ümumiləşdirmə* və *diferensiallaşdırma* qabiliyyətinin bir-biri ilə sıx və əlaqəli şəkildə mövcud olduğunu sübut edir.

Ümumi adların xüsusiyə keçməsində sözün fərqləndirmə, əşyaları tək-tək anlatma xüsusiyyəti əsas rol oynayır. Burada söz ümumiləşmiş məfhum adını bildirmir, xüsusi adı fərqləndirməyə xidmət edir.

## Nəticə / Conclusion

Arxaizmlər leksikanın maraqlı və ən qədim qatını təşkil edir. Dilin həm fonetik, həm qrammatik, həm də leksik xüsusiyyətlərini özündə birləşdirən bu sözlər leksikamız üçün qiymətli vahidlərdir. Arxaizmlər yazılı salnamələrdə, bədii ədəbiyyatda, etnoqrafik məlumatları özündə əks etdirən arxiv sənədlərində və başqa bu kimi mənbələrdə qorunub saxlanılaraq dövrümüzədək gəlib çatmışdır. Onları öyrənməklə dilimizin keçdiyi tarixi təkamül prosesini daha ətraflı şəkildə anlamaq mümkündür.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Adilov M., Verdiyeva Z., Ağayeva F. (2019). Azərbaycan dilinin semasiologiyası. Dərslik. Bakı, Elm. 303 s.
2. Cəfərov S. (2007). Müasir Azərbaycan dili. I cild. Bakı, Şərq-Qərb. 191 s.
3. Həsənov H. (2005). Müasir Azərbaycan dilinin leksikası. Bakı, Nurlan. 452 s.
4. Xəlilov B. (2008). Müasir Azərbaycan dilinin leksikologiyası. Bakı, Nurlan. 442 s.
5. Qurbanov A. (2010). Müasir Azərbaycan dili. I cild. Bakı, CBS. 436 s.
6. Qazi Bürhanəddin. (2005). Divan. Bakı, "Öndər" nəşriyyatı. 726 s.
7. Şah İsmayıl Xətayi. (2005). Əsərləri. Bakı, Şərq-Qərb. 382 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 98-107
doi.org/10.48445/a7028-2818-4035-w



# Əhməd Cavad və ədəbi dilimiz

***Sədaqət Həsənova***
Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim. Naxçıvan Dövlət Universiteti. Azərbaycan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**XÜLASƏ**
Məqalədə Azərbaycanın tanınmış şairi Əhməd Cavadın yaradıcılığı linqvistik baxımdan tədqiq edilir, şairin ədəbi dilimizdəki mövqeyi müəyyənləşdirilir və onun Azərbaycan dilinə münasibəti aydınlaşdırılır. Araşdırmada Əhməd Cavadın sözlərə məna verməsi, yeni ifadələr yaratması məsələsinə də toxunulur. Tədqiqat zamanı indiyə qədər lüğətlərdə qeyd olunmayan bir sıra sözlərdən də bəhs edilir. Həmin sözlərin üzə çıxarılması üçün bədii dilin araşdırılmasının zəruriliyi əsaslandırılır.

**AÇAR SÖZLƏR**
dil, üslub, söz, ifadə, məna

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 11.01.2023
qəbul edilib: 21.02.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 98-107
doi.org/10.48445/a7028-2818-4035-w

**A H M A D   J A V A D**

# Ahmad Javad and our literary language

***Sadagat Hasanova***

Doctor of Philology, Professor, Honored teacher. Nakhchivan State University. Azerbaijan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**ABSTRACT**

In the article, the creativity of the well-known poet of Azerbaijan, Ahmad Javad, is studied from a linguistic point of view. In this process, the position of the poet in our literary language is defined and his attitude towards the Azerbaijani language is clarified. The research also touches on the issue of Ahmad Javad giving meaning to words and creating new expressions. At the time of the study, which was not mentioned in the dictionaries until now a number of words are also mentioned. In order to reveal those words, the necessity of researching the artistic language is justified.

**KEYWORDS**

language, style, word, expression, meaning

**ARTICLE HISTORY**

Received: 11.01.2023
Accepted: 21.02.2023

## Giriş / Introduction

Ədəbi dilin bədii üslubu dil tariximizi, müxtəlif dövrlərdə dilimizdə baş verən hadisələri, ümumxalq danışığını, yeri gəldikcə dialekt leksikasını yaşadan zəngin və maraqlı qaynaqlardan biridir. Sözsüz ki, bədii dilimizin inkişafı söz sənətkarları olmadan mümkün deyil. Bu mənada, ayrı-ayrı yazarların yaradıcılığının linqvistik baxımdan araşdırılması əhəmiyyətli məsələlərdən biridir. Bu proses aşağıdakı cəhətlərə görə zəruri hesab edilir:

1. Hər bir sənətkarın dil-üslub xüsusiyyətlərinin öyrənilməsi onun ədəbi dilimizdəki mövqeyini üzə çıxarır və dilimizə münasibətini təyin edir.
2. Müxtəlif söz ustalarının linqvistik baxımdan araşdırılması ədəbi dilimizin dərindən və hərtərəfli öyrənilməsinə imkan yaradır.

Əhməd Cavad yaradıcılığına müraciət məhz yuxarıdakı xüsusiyyətlərə görə aktualdır.

Əhməd Cavadın yaradıcılığı poeziya dilimizin milli qaynaqlarındandır. Latın qrafikalı əlifbanı müdafiə edən ilk ziyalılardan olan, Balkan müharibəsində iştirak edən, könüllü əsgər kimi İstanbulun azadlığı uğrunda döyüşən, I Dünya Müharibəsində ermənilərə qarşı vuruşaraq XX yüzillikdə “şəhidlik”, “qaçqınlıq” məfhumlarının mahiyyətini hamıdan əvvəl dərk edən Əhməd Cavadı “poeziyanın Rəsulzadəsi” adlandıranlar səhv etməyiblər. O, üçrəngli poeziyamızın dil zənginliyini təsdiq edən və seçilən qələm sahiblərindən olmuşdur.

Şairin poeziyasına bələd olduqca sözün qüdrətinə heyran qalmamaq mümkün deyil. Əslində, onun işlətdiyi sözlər adi dil materiallarıdır. Lakin şair onları elə məqam və mənalara salır ki, dilimizin poetik təzahürü üzə çıxır. Gurultulu, təmtəraqlı söz və ifadələrdən uzaq olan şair dilimizə münasibətdə qeyri-adi dərəcədə həssasdır. Əhməd Cavadın 1913-cü ildə yazılmış “Dilimiz” şeiri onun mövzu ilə bağlı vətəndaşlıq mövqeyini ortaya qoymaqla yanaşı, şairin dilçi-alim qənaətləri səviyyəsindəki elmi-nəzəri fikirlərini də oxuculara tanıdır:

Baxaq dilimizə, nələr görünür?

Oxuyub anlamaq yazmaqdan gücdür.
Yazan düşünmədən yazsa da belə,
Oxucu beş-on gün gərək düşünə:
Ki, anlasın bu söz ərəbmi, farsmı? [4, s.102]

XX əsrin əvvəllərində dilimizin lüğət tərkibində ərəb və fars mənşəli alınmalar çoxluq təşkil edirdi. “Dilə alınmaların keçməsi müxtəlif səbəblərlə – məcburiyyət, başqa xalqlarla çoxşaxəli elmi, mədəni, siyasi, iqtisadi əlaqələr, obyektiv dil hadisələri, coğrafi şərait və s. ilə bağlıdır və həmin səbəblərin hamısı dilimizdəкi alınmaların varlığını şərtləndirir” [6, s.51]. Lakin Əhməd Cavadın yaradıcılıq dövrü dilimizdəki alınmaların, xüsusilə də ərəb-fars dillərindən keçmə sözlərin çoxluğu, işləkliyi və öz sözlərimizi sıxışdırdığı bir zamana təsadüf edir. Hər dövr üçün dildə zəruri olmayan alınmaların işlənməsi zərərlidir. Bu baxımdan Əhməd Cavadın yuxarıdakı misraları lazımsız alınmalara qarşı etiraz örnəyidir. Şair alınma sözlərə qarşı çıxmaqla yanaşı, mənasız sözlərin işlənməsini və ya sözlərin mənasının anlaşılmazlığını da qəbul etmir:

O ki qaldı məna... anlayan hanı.
Çoxları anlamaz millətdən, aydın,
Bircə parçasını şair yazanın [4, s.102].

Dilin inkişaf və saflığında söz sənətkarlarının rolu böyükdür. Bunu nəzərə alan Əhməd Cavad dilin leksik tərkibinin yad sözlərlə doldurulmasında şairlərin də rolunun olduğunu göstərir:

Gün oldu şairlər göyə çıxdılar,
Bu yazıq millətə ordan baxdılar.
“Od” etmədi, yağdı “atəş” başına,
“Siyah” qondardılar “qara” qaşına.
Alınır “dil”ləri, “zəban” verilir,
İsmarlanıb “baran”, “yağmur” kəsilir.
“Ağ”ları “bəyaz”a, “sarı”sı “zərd”ə
Döndü, can dayanmaz bu ağır dərdə [4, s.102-103].

Tarixən dildə aktiv mövqeli sözlərin qarşılığı ilə əvəz edilməsi və bu prosesdə alınmalara üstünlük verilməsini şair haqlı olaraq “ağır dərd” hesab edir. Bu, bütün zamanların, o cümlədən, çağdaş dövrümüzün də mühüm problemlərindəndir:

Dəyişdi hər şeyi, “bum” oldu “bayquş”,
“Əlbəsə” geyildi, “paltar” qaldı boş.
“Düzlüy”ün yerində bir “istiqamət”
Görərək, yeməli, zənn etdi millət.
Çalındı “qardaşı”, gəldi “bəradər”,
“Bacı”nın yerində “həmşirə” gəzər [4, s.103].

Əhməd Cavad dildə yad sözlərə önəm verilməsini "qiyamətə" bənzədərək "el oğlu" adlandırdığı dilimizin yazarlar tərəfindən farsla ərəbin "həmvətən"inə çevrilməsinin yaxşı nəticə verməyəcəyini göstərir:

Nədir bu qiyamət, nə işdəsiniz?
Ey bizim qocaman ədiblərimiz?
Yaxasından tutub bu "el oğlunu"
Fars ilə ərəbin bir "həmvətən"i
Şəklinə soxdunuz, baxınız sonra,
Oxunacaq lənət belə yazana! [4, s.103]

Əhməd Cavadın dilimizlə bağlı narahatlığına səbəb olan məsələlər bu gün də aktualdır. Sadəcə olaraq ərəb və fars sözlərini Avropa mənşəli sözlər, xüsusilə də ingilis sözləri əvəz edir. Şairin çaldığı "həyəcan təbili"nə dövrümüzdə daha çox ehtiyac duyulur.

Dilimizin təəssübkeşi kimi ədibin bədii sənətkarlıq keyfiyyətləri zəngindir və onların linqvistik cəhətdən araşdırılması bir sıra poetik dilçilik faktlarının bilinməsinə imkan yaradır. Şairin bədii sözişlətmə və ifadəyaratma bacarığı, demək olar ki, onun bütün yaradıcılığı boyunca müşahidə olunur. Onun qələminə məxsus aşağıdakı ifadələr bu fikri bir daha təsdiq edir: *sevda buludu, cəhalətin kor pəncəsi, telli yıldız, açıq gözlü röya, qara bəxtin buludu, fəraq ocağı, sevgipərəst, qəlbin istinadgahı, ömrün oğlan çağı, qəzəl hörmək, könüllər sultanı, avara tellər, can quşu, dalğalı gülüş, palaz bığlı, insanlıqdan qovulmaq, dinin dili, qıldıqsız günəş, ölüm padşahı, ehtişam əsiri, fikri dərinləşdirən qıvırcıq saçlar, vicdan pəncəsi, yavan sözlər, zülm daşı, sağlam iman, sevdalı gediş, dərdli gediş, kainatın sazı, qələmlərin düşüncəsi, daldı dərd, eşşək naşısı, şair bileti, xor ləhcəsi* və s.

İfadələrdəki "qıldıqsız" sözü maraqlı leksik-qrammatik vahidlərdəndir. Bu söz dialekt faktı olsa da, bədii dildə aktiv mövqeyi ilə seçilir. Əslində, bəzi qaynaqlarda, məsələn, filoloq Kübra Quliyevanın "Bədii ədəbiyyatda dialektizmlər" adlı əsərində qeydə alınan, "Azərbaycan dilinin dialektoloji lüğəti"ndə "dinsiz, məzhəbsiz" anlamını daşıyan, dil vahidi kimi verilən bu söz Borçalı,

Qazax, Şəmkir və Tovuz bölgələrinə aid edilir [7, s.150; 2, s.296]. “Azərbaycan dilinin izahlı lüğəti”ndə də “qıldıq” – inam, etiqad, inanma, “qıldıqsız” – inamsız, etiqadsız, inanmayan, etibarsız mənalarını ifadə edən leksik vahidlər kimi təqdim edilmişdir [3, s.134]. Lakin dilçi-filoloq Bəşir Əhmədovun hazırladığı “Etimologiya lüğəti. Araşdırmalar, mü-lahizələr” adlı kitabda “qıldıqsız” sözünün işi səliqə-sahmanla yerinə yetirməyən adamlar haqqında deyildiyi göstərilir [Əhmədov B. Bakı, 2015]. Fikrimizcə, Əhməd Cavadın qələmində bu söz son anlamına, “səliqə-sahmansız” mənasına daha uyğundur. “Qıldıqsız (sahmansız) günəş” daha poetik səslənir və burada Əli Kərimin “*Qayıt, yerinə qoy Ayı, Günəşi, Qayıt, sahmana sal bu kainatı”* misraları yada düşür.

Sözsüz ki, bədiilik elmi olan poetikada deyim mədəniyyəti, obrazlılıq və üslub gözəlliyi əsas məsələdir. Bədii dildə sözlər poetik mərama xidmət göstərərək mühüm məntiqi-üslubi səciyyə daşıyır. Bu mənada, Əhməd Cavadın dilində müraciət obyektləri də diqqəti çəkir. Onun “Dan ulduzu” şeirinə nəzər salaq:

Bu qaranlıq gecə nə qədər sürdü,
Yetiş imdadıma, ey Dan ulduzu!
Barı sən gəl, mənə yuxu gəlmədi,
Yetiş fəryadıma, ey Dan ulduzu! [4, s.108]

Dilimizin semantik zənginliyindəndir ki, nəinki əsas, hətta köməkçi nitq hissələrinin də bədiilik yaratmaq imkanları vardır. Bu baxımdan bağlayıcı, ədat və nidalar xüsusi ilə fərqlənir. Belə ki, onların emosionallıq və ekspressivliyə malik xüsusiyyətləri poetik dildə daha güclü səslənir:

Qudurğan qasırğa, çarpaşıq yollar,
Yolumda zülmət var, uçurumlar var.
Yetiş ki, ömrümün karvanı ağlar,
Aman, gəl dadıma, ey Dan ulduzu! [4, s.108]

Köməkçi nitq hissələri bədii mətnin semantikasında mühüm əhəmiyyət daşıyaraq hiss və duyğuların arzu edilən səviyyədə

çatdırılmasında özünəxas rola malikdir. Bu, onu deməyə imkan verir ki, dildə nəinki sözlərin, hətta adi bir işarənin də mahiyyəti vardır. Köməkçi nitq hissələri bəzən o qədər fəallaşır ki, bədii vasitələrdən seçilmir. Bəzən eyni köməkçi nitq hissəsinin bir söz daxilində fərqli işlənməsi məqamları ilə də qarşılaşırıq:

Tezcənə başa vurur
Yarıda öz ömrünü! [4, s.197]

Yuxarıdakı örnəkdə "tez" zərfinə qoşulmuş *-cə* ədatından sonra *-nə* hissəsinin gəlməsi fikri daha gücləndirir.

Bu ağır başlıca baxışın mənə
Qanlı əfsanələr söylər, a dağlar! [4, s.210]

Buradakı “ağır başlıca baxış” maraqlı və orijinal ifadələrdəndir. Adətən, insana aid olan “ağır başlı” qeyri-təyini ismi birləşməsinin “baxış” sözünə epitet seçilməsi diqqəti cəlb edir. İfadənin ikinci tərəfinə artırılan *-ca* ədatına görə fikir bir qədər də qüvvətlənir.

Bu sönük ulduzlar məni aldadır,
Süzgün gözlərinlə gəl “onu” andır!
Gözlərim yolunda, üzüm haqdadır,
Aman, sən “yox” demə, ey Dan ulduzu! [4, s.108]

Poetik dilin bədiilik imkanlarının zənginləşdirilməsində, şeir mətnində hiss və həyəcan yaradılmasında bağlayıcı, ədat və nidaların rolu yuxarıdakı örnəkdən aydın şəkildə bəlli olur.

Əhməd Cavadın “Dan ulduzu” şeirini oxuyanda Cəfər Cabbarlının eyni adda, eyni ritmdə, eyni ölçü və bölgüdə yazılmış şeiri yada düşür. Bu, sənətkarların bir-birinə təsirini göstərir. Fikrimizcə, Əhməd Cavadın 1914-cü ildə yazılmış şeiri Cəfər Cabbarlıda dərin maraq oyatmışdır.

Şairin dilində çox sayda hikmətli fikirlərlə qarşılaşmaq olar:

Namussuzluq çox alçaqdır,
Bizi haqq da dinləməz!
Qorxaq, alçaq bir millətə
Tanrı da yol göstərməz! [4, s.109]

Yaman günün ömrü azdır [4, s.111].

Böyük dərddir Vətən dərdi [4, s.111].

Bəncə, dərdin ən yamanı
İtirmək dərd anlayanı [4, s.134].

Bayatı ağız ədəbiyyatına məxsus janr kimi səciyyələndirilib xalq yaradıcılığına xas hesab edilsə də, söz xəzinəmizdə müəllifli bayatılar da vardır. Şairlər arasında bayatı müəllifləri azlıq təşkil edir. Onlardan biri də Əhməd Cavaddır:

Dağlara dolu düşdü,

At gəzib, nalı düşdü.
Ölsəm, yol üstə basdır,
Bəlkə yar yolu düşdü [4, s.187].

Bu fikrin qoşmadakı ifadə variantına Aşıq Ələsgər yaradıcılığında da rast gəlirik. Hər iki sənətkarda lirizmin dərin ifadəsi insanı heyran edir.

Qazdır məzarımı çeşmə başında,
Sal sinəm üstündən yol, incimərəm [1, s.56].

Əhməd Cavadın bir çox bayatıları hazırda xalq mahnılarının mətnlərində səslənir və bu bayatıların müəllifli olduğunu bilənlər ya yoxdur, ya da az saydadır.

Əzizim, gözdə qara,
Sürmə çək gözdə qara.
Əziz yar gözləməkdən
Qalmadı gözdə qara [4, s.186].

Əziziyəm, Gəncə var,
Şəki, Şirvan, Gəncə var.
El bilir, ayrılmışıq,
Məhəbbət ölüncə var [4, s.189].

Əhməd Cavadın dilində xalqımızın qədim deyimlərindən olan qarğışlar da müəyyən mövqeyə malikdir:

Əzizim, hara gəlsin,
Zülfünü dara, gəlsin.
Mənsiz bayram eyləsən,
Bayramın qara gəlsin! [4, s.164]

Və ya hamının ağı kimi tanıdığı aşağıdakı qəmli bayatının da müəllifi Əhməd Cavaddır:

Dağların qarı mənəm,
Gün düşsə, ərimərəm.
Qəbrim quzeydə olsa,

Cavanam, çürümərəm [4, s.166].

Yas mərasimlərində bu ağını dəfələrlə eşitmişik. Fərq burasındadır ki, el dilində üçüncü misra belə səslənir: “*Qəbrimi quzeydə qaz*”.

Əhməd Cavadın bayatılarında maraqlı cəhətlərdən biri budur ki, onun dilində “o” işarə əvəzliyindən “ho” kimi istifadə olunur:

Samovar dolub daşar,
Ho gül kimə yaraşar?
Ho gül bizə olmasa,
Tamam dağ-daş ağlaşar [4, s.178].

Yanaşa beş otaqlar,
İçində qızıl taxtlar.
Bir-bir yadıma düşür
Ho gəlib keçən vaxtlar [4, s.179].

“Azərbaycan dilinin dialektoloji lüğəti”ndə işarə əvəzliyi mövqeyində Dərbənd və Tabasaran dialekti kimi qeyd edilən bu söz, görünür, yalnız həmin məkanlarla məhdudlaşmır.

Şairin “Pambıq dastanı” əsərinin dili bir çox cəhətdən maraqlıdır. Bu mənada əsərin dilindəki təsadüfi alınmalar diqqət cəlb edir. Pambığın müxtəlif xalqların dilindəki adını göstərən müəllif, əslində, onun şöhrətinin yayıldığı məkanların coğrafiyasını bədii dilə gətirir. Özbək dilində “paxta”, qırğız və kazak dilində “maxta”, Çində “hoam ien”, Xarəzmdə “Amerkan qoza” və s. adlanan pambığın yapon dilində “ağac yunu” mənasında işlənməsindən bəhs edən şairin dili həmin alınmalarla ağırlaşmır, buradakı varvarizmlər onun məqsədini aydınlaşdırır. Pambığı quşbaşı yağan qara, ağ gülə bənzədən, haqqında “gülxətmiyə naz satan”, “ağ masal” ifadələrini işlədən şairin həmin əsərində “çətək” sözü ilə qarşılaşdıq, lakin lüğətlərdə ona rast gəlmədik:

Təpələr çətəyində
Sallanır qəşəng-qəşəng [4, s.242].

Bundan başqa, “Pambıq dastanı” əsərinin dilində işlənən “hiyən”, “sarğılamaq” sözləri də lüğətlərimizdə, hətta Kübra Quliyevanın “Bədii ədəbiyyatda dialektizmlər” adlı monoqrafiyasında qeydə alınmamışdır:

Qızlara “gəl-gəl” deyən
Arançıya bir hiyən [4, s.243].

Bərəkətli ellərdə
Kölgəni sarğıladı [4, s.244].

Bunlar şairin dilinin dərindən öyrənilməsinə əsas verir. Belə ki, poetik dildə elə faktlar vardır ki, onlar heç bir lüğətə düşməyib. Həmin faktlar dilimizin zənginliyini

göstərən dil vahidləridir. Xüsusilə də milliliyi ilə seçilən feillərin üzə çıxarılması maraqlı və zəruri işlərdəndir.

**Nəticə / Conclusion**

Beləliklə, Əhməd Cavad araşdırılmağa layiq ədəbi simalardandır. O, nədən, kimdən, haradan yazırsa-yazsın, yaradıcılığında vətənin təbiəti mövzusu öndə gəlir. Poeziya xəritəsində Gəncəni, Göygölü, Kürü, Arazı qırmızı xətlə cızan şair xüsusi adları bədii obraza çevirməkdə öndə gedən söz ustalarındandır.

Mənim üçün
Kür baş vurur hər yerə,
Araz Məcnun olub
Düşüb çöllərə [4, s.250].

Bir zamanlar Əhməd Cavad deyirdi:

Millətimin tarixinə
Şan-şöhrət əkməliyəm! [4, s.206]

O, doğrudan da, üçrəngli poeziyamızın şan-şöhrəti olaraq xüsusi mənəvi yaşam qazanan söz sənətkarlarından biri kimi Azərbaycan ədəbiyyatı, mədəniyyəti və ədəbi dili tarixində imzası olan şairlərdəndir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Aşıq Ələsgər. (2004). Əsərləri. Bakı, Şərq-Qərb. 400 s.
2. Azərbaycan dilinin dialektoloji lüğəti. (2007). Bakı, Şərq-Qərb. 568 s.
3. Azərbaycan dilinin izahlı lüğəti. (2006). Dörd clddə, III c. Bakı, Şərq-Qərb. 672 s.
4. Əhməd C. (2005). Seçilmiş əsərləri. Bakı, Şərq-Qərb. 296 s.
5. Əhmədov B. (2015). “Etimologiya lüğəti. Araşdırmalar, mülahizələr”. Bakı, Altun Kitab.

6. Həsənova S. (2006). “Füyuzat” jurnalı və dil problemləri. Bakı, 298 s.
7. Quliyeva K. (2019). Bədii ədəbiyyatda dialektizmlər. Bakı, Elm və təhsil. 288 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 108-114
doi.org/10.48445/l2680-9347-6952-w

ƏHMƏD CAVAD

# Əhməd Cavad poeziyasında poetik sintaksis haqqında bəzi qeydlər ("Səsli qız" poeması əsasında)

***Ədalət Abbasov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent. Azərbaycan Dövlət Pedaqoji Universiteti,
Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası. Azərbaycan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**XÜLASƏ**
Azərbaycanın ədəbi-bədii fikir tarixində özünəməxsus dəst-xətti ilə seçilən görkəmli ədib Əhməd Cavadın istər "Qoşma" adlı ilk kitabında, istərsə də yaradıcılığının dinamik səviyyəsinin təzahürü olan və əsərlərinin böyük hissəsinin toplandığı "Dalğa" kitabında xalq ədəbiyyatının təsiri aydın şəkildə hiss olunur. Eyni poetik duyğu, obrazlı (ekspressiv) şərait, estetik zövq şairin digər əsərlərində olduğu kimi, "Səsli qız" poemasında da qüvvətlidir. Söz və ifadələrin yerli-yerində, kommunikativ funksionallıq cəhətdən məqamında işlədilməsi sayəsində oxucu poetik ideya və obrazlar aləmində fəal bir şəxsə çevrilir. Misralarda sanki incitək düzülən sözlər semantik (poetik) mühitin formalaşmasına, nəticədə isə ideya-məzmun xəttinin qüvvətlənməsinə xidmət edir. Şair dilin

**AÇAR SÖZLƏR**
dinamik səviyyə,
rəvan dil,
neytral leksika,
poetik semantika,
sintaktik fikir

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib:
08.01.2023
qəbul edilib:
13.02.2023

informativ və ekspressiv funksiyalarından geniş kontekstdə istifadə etdiyi “Səsli qız” poemasında zəngin məcazlardan – bədii təsvir və poetik fiqurlardan kifayət qədər bəhrələnərək poetik sintaksis mühitinin formalaşdırılmasına nail olmuşdur.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 108-114
doi.org/10.48445/l2680-9347-6952-w



# Some notes about poetic syntax in Ahmad Javad's poetry (Based on the poem "Sesli giz")

***Adalat Abbasov***
Doctor of Philosophy in Philology, Associate Professor. Azerbaijan State Pedagogical
University, Department of Azerbaijani language and its teaching technology. Azerbaijan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**ABSTRACT**
The influence of folk literature can be clearly felt in the first book of the famous writer Ahmet Javad, who stands out in the history of Azerbaijan's literary and artistic thought with his unique handwriting, either in his first book called "Goshma", or in the book "Dalgha", which is a manifestation of the dynamic level of his creativity and where most of his works are collected. The same poetic feeling, figurative (expressive) conditions, and aesthetic taste are strong in the poem "Sesli giz" as in other works of the poet. The reader becomes an active person in the world of poetic ideas and images thanks to the local use of words and phrases in terms of communicative functionality. It is as if the words that are carefully arranged in the verses serve to form a semantic (poetic) environment, and as a result, to strengthen

**KEYWORDS**
dynamic level,
fluent language,
neutral lexicon,
poetic semantics,
syntactic idea

**ARTICLE HISTORY**
Received:
08.01.2023
Accepted:
13.02.2023

the idea-content line. The poet used informative and expressive functions of the language in a wide context in the poem "Sesli giz" and succeeded in shaping the environment of poetic syntax by making sufficient use of rich metaphors - artistic images and poetic figures.

## Giriş / Introduction

Cümhuriyyət dövründə qələmə aldığı əsərlərin əksəriyyətini müstəqil ölkəmizin tərənnümünə həsr etdiyi üçün “cümhuriyyət nəğməkarı” adlandırılan qüdrətli sənətkar Əhməd Cavadın poeziyası qısa müddət ərzində müəllifinə böyük hörmət qazandırmışdır. Ona bu şöhrəti qazandıran vətənpərvərlik, müstəqillik, azadlıq və ümumbəşəri ideyaların təbliği ilə yanaşı, yaradıcılığındakı sadə dil, anlaşılan üslub əlamətləri olmuşdur.

Dövrünün ədəbi dil mühitinin diktəsi səbəbindən yaradıcılığının ilk dövrlərində əsərlərində ərəb-fars sözlərinin çox işləndiyi ənənəvi məcazlara geniş rast gəlinsə də, zaman keçdikcə həmin poetik məcazlar doğma dilimizin kəlmələri ilə əvəzlənmiş, Əhməd Cavad yaradıcılığının lüğət tərkibində bir durulaşma müşahidə edilmişdir.

Eyni poetik duyğu, estetik zövq şairin digər əsərlərində olduğu kimi, “Səsli qız” poemasında da təsirli səslənir. Poemadan verilən aşağıdakı misraları poetik sintaksis aspektdən nəzərdən keçirək:

Oxudum tarixlərdə:
Qaniçən bir hökmdar
Bir ölkəni amansız
Eyləmişdir tari-mar!
Altı aydan çox sürən
Qanlı bir mühasirə,
Tutulmuşdu çox acı
Basqına birdən-birə!

Ekspressiv istiqamətin təhlilinə keçməzdən əvvəl mühüm bir məsələni qeyd etməliyik ki, şeir parçasının dili olduqca sadə və anlaşıqlıdır. Söz və ifadələrin yerli-yerində, kommunikativ funksionallıq cəhətdən məqamında işlədilməsi sayəsində oxucu poetik ideya və obrazlar aləmində fəal bir şəxsə çevrilir. Bu baxımdan da şa-irin qarşıya qoyduğu ideya-məzmunun estetik təsiri mahiyyət etibarilə üzə çıxır.

Maraqlıdır ki, misraların zahiri və daxili mənaları bir-biri ilə uzlaşır. Sanki incitək düzülən sözlər semantik mühitin

formalaşmasına, beləliklə də, ideya-məzmun xəttinin qüvvətlənməsinə səbəb olmuşdur. Poetik müstəvini obrazlı şəkildə ekspressiv dil ilə yalnız söz sahibi olan sənətkar aşağıdakı kimi ifadə edə bilərdi:

İgidlərin son səsi.
Yurdunu verməyənlər
Doğranmışdı xınchaxınc.

Şeir parçasının komponentlərini təşkil edən hər bir söz (doğranmışdı) və söz birləşmələri (igidlərin son səsi – III n.t.s.b.; yurdunu verməyənlər – f.b.) ümumi ideyanın ifadəsinə xidmət etməklə yanaşı, həm də lüğəvi zənginliyin təzahürüdür. Verilən bənddə “xınchaxınc” sözünə diqqət edək. “Tikə-tikə” və ya “əzik-əzik” mənasını bildirən bu söz, vaxtilə (şairin yaşayıb-yaratdığı dövrdə) leksik arxaizm mövqeyində işlədilmişdir. Hazırda isə dilimizin qərb qrupu dialektlərində (xüsusilə Şəmkir, Gədəbəy, Tovuz və Qazax-Ağstafa bölgələrində) dialektik leksik vahid ola-raq işlədilir. Şeirdə təsadüf etdiyimiz bu və ya onlarla leksik-arxaizm, leksik-dialektik vahidlərdən istifadə böyük nəğməkarın xalq dilinə yaxından bələd olmasının göstəricisi kimi dəyərləndirilə bilər. Ana dilinə ən dərin incəliklərinə qədər bələd olması vətənpərvər, istiqlal şairinin doğma dilinə sonsuz sevgisindən doğan amillə bağlıdır.

Dilin informativ və ekspressiv funksiyalarından geniş kontekstdə istifadə edən şair “Səsli qız” poemasında zəngin məcazlardan – bədii təsvir və poetik fiqurlardan kifayət qədər bəhrələnmişdir:

Ölüm rəngi çökmüşdü, saralan üz-gözlərə,
Cənnət kimi bir ölkə məzarlığa dönmüşdü.

Birinci misrada (Ölüm rəngi çökmüşdü, saralan üz-gözlərə) metafor vasitəsilə doğan bədbin əhvali-ruhiyyəyə qapılmış vətəndaş obrazı canlandırılmışdır. Bu, simvolik obraz səciyyəsi daşıyır. Poemanın məzmunundan həmin obrazın şairin öz prototipi olduğu qənaətinə gəlmək mümkündür. Sonrakı misrada (Cənnət

kimi bir ölkə məzarlığa dönmüşdü) ifadə edilən davamedici, nəhayət, tamamlayıcı məna bu qənaəti təsdiq edir. Şair təşbeh üsulu ilə (cənnət kimi bir ölkə) öz vətənini cənnətə bənzətməklə doğma yurduna məhəbbətini fəxrlə dilə gətirir. O, müharibənin təsirindən ölkəsinin məzarlığa çevrilməsini böyük bir acı ilə anır. Bu hissədə biz, şa-irin sintaktik fiqurdan – antitezadan istifadə etdiyinə şahid oluruq. İnsan psi-xologiyasının ən incə, kövrək hissləri olan kədər və sevinc bu poetik kontekstdə vəhdətdə ifadə edilir. Nəticədə, kədərlənən, eyni zamanda sevinən şair obrazı ilə qarşılaşırıq. Bir məsələni də xüsusi ilə qeyd etmək lazımdır ki, şairin bu emosional vəziyyəti – kədərli və sevincli olması fərdi (şəxsi) səciyyə daşımır. Bu, ictimai xarakterli hisslərdir. Çünki "cümhuriyyət nəğməkarı"nı təbii ki, ilk növbədə, vətəninin müstəqilliyi və ərazi bütövlüyü, xalqının azadlıq və istiqlaliyyəti düşündürürdü. Həmçinin onu da qeyd etməliyik ki, bu düşüncə və arzular bir ideoloji səviyyədə təqdim edilir.

“Ümumiyyətlə, şeir dilinin başlıca məntiqi və linqvistik əsası misradır. Şeirin ritmik, intonasion, sintaktik xüsusiyyətləri bu başlıca qrafik əlamətə – misraya tabe etdirilir və ondan asılı olur. Sözlərin seçilməsi və obrazlılıq da misra ilə əlaqələndirilməli olur” [3, s.435].

Poemadan digər bir parçaya diqqət edək:

Əsgərsiz komandanlar
Qırıb atdı yayını,
Fələk döndərdi zəhrə
Bu ölkənin payını.
Gülmək zatən yox idi.
Ağlamaq oldu yasaq.
Zavallı məğlub ölkə,
Sana nə hüquq, nə haqq!...

Bu nümunədə də şair müxtəlif səhnəciklərlə müharibə lövhələri təsvir edərək ağlamaq yasaq edilmiş, gülməyə həsrət qalan hüquqsuz və zavallı məğlub ölkə obrazı yaratmışdır. Bu cür poetik lövhənin yaradılmasında antonim leksik vahidlərdən ibarət məcaz konstruksiyalarının rolu da olduqca böyükdür.

“Əsl şeir, əsl şeiriyyət – obrazlılıqdır, mənalılıqdır”. Əlbəttə, hər cümlədə (cümlə düzgün qurulmuşsa) müəyyən fikir ifadə olunur, deməli, hər cümlədə müəyyən məna vardır. Lakin şeirdəki məna, şeirdəki söz daha təsirli, daha tutarlı, daha kəsərli olur!” [2, s.302-303].

Əhməd Cavadın istifadə etdiyi məcazlar, sintaktik fiqurlar və təsvir etdiyi obrazlar ideya ilə ideallıq baxımından bir-biri ilə əlaqəlidir:

Haqqı yoxdu kimsənin
Söz deyib, dərd açmaya.
Bəzənib çıxmalıydı
Gələnlər ağlaşmaya.
Döndü, oldu qəhqəhə

Qan qusan hıçqırıqlar.
Çiçək səpəcək oldu
Bütün qəlbiqırıqlar.

Şeiri nəzərdən keçirdikdə görürük ki, söz və ifadələr, mövcud təsvirlər dərin ideya məzmununa malikdir. Şeir parçasının ilk misraları şairin mənəvi azadlığa eyhamı kimi dəyərləndirilə bilər. Müstəqillik konsepsiyasının komponenti hesab edilən həmin ideya şairin şəxsi istək və arzu müstəvisindən ictimai ideologiya səviyyəsinədək yüksəlir.

Bu kontekstdən çıxış edərək deyə bilərik ki, Əhməd Cavad şeirinin səciyyəvi cəhətləri içərisində ümumiləşdirmə xüsusi rol oynayır. Bu tipikləşdirmə üsulundan şairin bütün şeirlərində ədəbi priyom kimi geniş istifadə edildiyinin şahidi oluruq.

"Heç bir üslub məhdudluğunu yaxın qoymadığından sənətkarın bədii əsərinin dili hər şeydən əvvəl lüğətinin zənginliyinə görə fərqlənir" [1, s.260].

Ə.Cavad poeziyasının maraqlı xüsusiyyətlərindən biri də misradaxili sintaktik prosesdir. "Sintaksis, fikrin ifadə formasıdır, qəlbidir – düşüncənin, emosiyanın biçimidir. Cümlələrin həcmi, məntiqi əlaqəsi də sintaksisdir və sintaksis bütövlükdə obrazlılığın məskənidir" [4, s.4].

Onu da qeyd etməliyik ki, poeziyada poetik sintaksisin formalaşmasında sintaktik fiqurlar başlıca funksiyaya malikdir. Ə.Cavad poeziyasında, xüsusilə ekspressiv aspektdən təhlil etməyə çalışdığımız "Səsli qız" poemasında da bu cür məcaz vasitələrindən kifayət qədər geniş istifadə edilmişdir:

Can verən sərxoş gecə
Ölürkən yorğun, əzgin –
Coşdu qızın səsində
Ölkədə qaynayan kin.

Metafor olan ilk misra, eyni zamanda sintaktik fiqurun funksional tiplərindən sayılan inversiyadır. Dilimizin söz sırası qanununa əsasən, "Can verən sərxoş gecə, yorğun, əzgin ölürkən"

strukturunda verilməlidir. Lakin misra məzmunla informasiya müstəvisindən obrazlı kontekstə çevrilmə məqsədilə şair tərəfindən bilərəkdən inversiyaya uğradılmışdır. Digər misra isə nəsr quruluşu baxımından “Ölkədə qaynayan kin coşdu qızın səsində” kimi olmalıdır. Ancaq ilk misrada olduğu kimi burada da fikrin daha güclü, təsirli və emosional səslənməsi məqsədilə söz sırası məqsədyönlü şəkildə pozulmuşdur.

## Nəticə / Conclusion

Beləliklə, şair əlinə düşən hər fürsətdə ədəbi priyomlardan geniş şəkildə istifadə etməklə məqsədinə çatmağa nail olmuşdur. Bir sözlə, poemanın bütün misralarında işlənən hər bir obrazlı söz və ifadə, ümumilikdə poemanın poetik sintaksisinin strukturunun reallaşmasına xidmət edir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Adilov M. (2020). Əsərləri, IX cild, Məqalələr. Bakı, Elm və təhsil. 443 s.
2. Adilov M. (2020). Əsərləri, VIII cild, Məqalələr. Bakı, Elm və təhsil. 697 s.
3. Adilov M. (2020). Əsərləri, V cild, Sənətkar və söz. Bakı, Elm və təhsil. 459 s.
4. Kazımov İ. (2020). Sadə cümlə sintaksisi. Elmi red. Məşədiyev Q. Bakı,
5. Avropa. 223 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 115-129
doi.org/10.48445/w1431-4490-5774-u

**Ə D Ə B İ   M Ü H İ T**

# Şair Şahnigar xanım Rəncurun ədəbi portreti

***Minaxanım Nuriyeva Təkləli***
Filologiya elmləri doktoru, professor. Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: proftomris@gmail.com
https://orcid.org/0000-0002-4985-8134

**XÜLASƏ**
XIX əsr Azərbaycan tarixinin mürəkkəb və ziddiyətli dövrü olmaqla yanaşı, öz zənginliyi və mövzu mənbələri baxımından ədəbiyyatımızın ən məhsuldar mərhələlərindən biri hesab edilir. Lakin buna baxmayaraq, bu dövrdə yaşayan ədib və şairlərin demək olar ki, böyük bir qisminin həyat və yaradıcılığı hələ də diqqətdən kənarda qalmaqdadır. Təbii olaraq, buna mənbə qıtlığı ilə yanaşı, əski əlifba probleminin səbəb olduğunu da nəzərə almalıyıq. Məqalədə bu qəbildən olan mütəfəkkir şairimiz – Azərbaycanda və Amasiyada (Türkiyə) yaşamış Mir Həmzə Nigarinin sadiq davamçılarından olan Şahnigar xanım Rəncurun həyatı, ədəbi fəaliyyəti və çevrəsi barədə əldə etdiyimiz məlumatlar əsasında ədəbi portretini canlandırmağa çalışacağıq.

**AÇAR SÖZLƏR**
Nigari, Rəncur, şeir, ədəbiyyat, mənbə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 18.01.2023
qəbul edilib: 05.03.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 115-129
doi.org/10.48445/w1431-4490-5774-u

**LITERARY ENVIRONMENT**

# Literary portrait of the poet Shahnigar khanum Ranjur

***Minakhanim Nuriyeva Tekleli***
Doctor of Philological Sciences, Professor. Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: proftomris@gmail.com
https://orcid.org/0000-0002-4985-8134

**ABSTRACT**
In addition to being a complex and conflicting period of Azerbaijan's history, the 19th century is considered one of the most productive stages of our literature in terms of its wealth and subject matter sources. However, the life and work of almost a large part of the writers and poets who lived in this period are still overlooked. Naturally, we must take into account that this is caused by the problem of the old alphabet, in addition to the lack of sources. In the article, we will try to revive the literary portrait of our thinker poet Shahnigar khanum Ranjur who was a loyal follower of Mir Hamza Nigari who lived in Azerbaijan and Amasya (Turkey) based on the information we have about his life, literary activity, and environment.

**KEYWORDS**
Nigari, Ranjur, poem, literature, source

**ARTICLE HISTORY**
Received: 18.01.2023
Accepted: 05.03.2023

## Giriş / Introduction

Azərbaycan tarixi üçün ziddiyətli, coşqun, həmçinin zəngin bir dövr olan XIX əsr ideya-mövzu mənbələri baxımından ədəbiyyatımızın ən məhsuldar mərhələlərindən hesab edilir. Bu dövrdə bir çox istedadlı ədiblərin yetişməsinə baxmayaraq, indiyədək onların böyük qisminin adı sadəcə təzkirə və ədəbiyyat antologiyalarında bu və ya digər formada qeyd edilmiş, hətta bir çoxunun həyat və yaradıcılığı kifayət qədər işıqlandırılmamışdır. Buna, bəzən haqlı olaraq mənbə qıtlığı səbəb gətirilsə də, bir çox hallarda isə bu barədə kifayət qədər mənbələr mövcud olduğu halda “diqqətdən kənar qalmış gərəkli mövzular”, “məqsədli şəkildə “unudulmuş şəxsiyyətlər” deməyimiz daha ədalətli olardı. Beləliklə, Azərbaycan ədəbiyyatının məzmunlu, dolğun səhifələrini təşkil edəcək şəxsiyyətlərin kölgədə qalıb unudulması əsas iki səbəblə – müasir araşdırmaçıların bir çoxunun əski əlifbamıza lazımınca bələd olmaması və bir çox ədiblərin, görkəmli simaların fəaliyyətlərinin mövcud hakim ideologiyaya zidd hesab edilmələri ilə bağlı olmuşdur.

Azərbaycan ədəbiyyatının uzun müddət qaranlıqda qalaraq üzə çıxarılmamış, hətta bilərəkdən unudulmuş və “yad” sandığı şairlərindən biri də Şahnigar xanım Rəncur olmuşdur. “Rəncur” təxəllüslü Azərbaycan şairi Şahnigar xanım haqqında ilk ətraflı məlumata Firidun bəy Köçərlinin iki cildlik “Azərbaycan ədəbiyyatı” kitabında rast gəlinir [4, s.263-268]. Şair haqqında o qədər də çox olmayan mənbələr içərisində qardaş Türkiyədəki ədəbiyyat nümunələrində, o cümlədən zəngin mühacir mətbu orqanı olan “Azerbaycan Yurt Bilgisi” adlı dərgidə müşahidə etdiyimiz yazıları nümunə göstərə bilərik.

Günümüzə gəldikdə isə Azərbaycan klass
öyrənilməsində əslən Qarabağlı, lakin Amasiyada yaşamış Mirzadə Fəxrəddin Ağabalinin “Həzrəti-pir” adlandırdığı şərafətli qohumu Mir Həmzə Nigarinin həyat və yaradıcılığına həsr etdiyi mənqibə tipli “Hümayi-Ərş” adlı əsərindən Şahnigar xanımın həyatı

haqqında məlumatlar və həmin qaynaqdan Rəncurun yeni əldə etdiyimiz bir çox şeirləri apardığımız işin məzmununu zənginləşdirir. Əsl adı Şahnigar, qızlıq soyadı Qiyasbəyli olan şairə şeirlərini "incik, rəncidə" mənasını verən "Rəncur" təxəllüsü ilə yazmışdır. Rəncurun əldə olan şeirlərinə əsasən onun ədəbiyyatımızdakı rolunu müəyyən edərək sənətkarlığı haqqında da onu demək mümkündür ki, bu dolğun poetik nümunələrdə istedadla ilhamın fövqəladə uyuşması təsirli, unudulmayacaq, duyan qəlbin silinməyəcək təəssüratlarıdır.

Mütəfəkkir şairimiz Rəncur Şahnigar "cənnət Qarabağda göz açmış... Azərbaycanda – Qarabağda, ardınca Türkiyədə yaşamış yurd, millət sevdalısı" Nəqşibəndi şeyxi Mir Həmzə Nigarinin davamçılarından olmuşdur [6, s.13]. Şeirlərini diqqətlə incələdikdə onun Şeyx Nigari ilə davamlı olaraq məktublaşdığı və bir-birinə yüksək etibar, dərin hüsn-rəğbət bəslədikləri aydın görünür. Rus imperiyası tərəfindən türk torpaqlarının, o cümlədən Qarabağın işğalı zamanı Seyid Mir Həmzə Nigari öz müridləri ilə bərabər torpaqlarımızın müdafiəsinə qalxmış, hələ o dövrdə Azərbaycanın, eləcə də cənnət Qarabağın rus imperiyası tərəfindən işğal edilməsindən doğan ağrı-acıları, xalqın Qarabağ sevgisini bütün çalar və incəlikləri ilə əks etdirən şeirlər yazmışdır. O dönəmlərdə Qarabağın ruslar tərəfindən işğalını öz şeirlərində ağır milli faciə kimi əks etdirmiş, bu qanlı hadisənin sinəyə sancılan xəncər olduğunu nəzərə çatdırmışdır [6, s.13]. Bu səbəbdən Krım müharibəsi illərində (1853-1856) Osmanlı dövlətinin mənafeyi uğrundakı fəaliyyətinə görə təhlükəli vəziyyət yarandığı üçün vətəndən uzaqlaşmalı olmuşdur [9, s.69; 1, s.73].

Azərbaycan ədəbiyyatı tarixi qaynaqlarında Şahnigar xanım barədə məlumat yalnız Firidun bəy Köçərlinin iki cildlik "Azərbaycan ədəbiyyatı"nda verdiyi qısa tərcümeyi-hal və bir neçə şeirindən ibarətdir. Təəssüf doğuran hallardan biri də budur ki, müasiri olduğu dövrün – XIX əsr ədəbiyyatı haqqında əsas tarixi mənbələr sayılan Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab", Ağa Məhəmməd Müctəhidzadənin "Riyazül-Aşiqin" adlı təzkirələrində və Salman Mümtazın "Azərbaycan ədəbiyyatı tarixi qaynaqları"

antologiyasında şairə haqqında heç bir məlumata rast gələ bilmədik. Lakin qeyd etməliyik ki, artıq XX əsrin ortalarına doğru Azərbaycan ədəbiyyatı və mədəniyyət tarixində özünəməxsus yeri olan bir sıra yaradıcı elm, sənət, ədəbiyyat xadimlərinin həyat və fəaliyyətlərinin öyrənilməsinə maraq artmış, ciddi araşdırma yazılar meydana çıxmışdır. Buna mühacir ədəbiyyatı örnəklərində, o cümlədən Türkiyədə çap olunan "Azerbaycan Yurt Bilgisi" adlı jurnalın 1934-ci il 25-ci sayında Şeyx Nigarinin yaxını olan bir ailədə pərvəriş tapmış soydaşımız Mirzadə Mustafa Fəxrəddin Ağabalinin "Azerbaycan şairlerinden Rencur Hanım" adlı məqaləsinin nəşrini nümunə göstərmək olar. Müəllif məqalədə şairənin həyatından qısa şəkildə bəhs etməklə bərabər, bir neçə şeirini də dərc etdirmişdir.

Ölkəmizdə də bu sahədə irəliləyişlər gözə çarpmaqdadır. Bu istiqamətdə son illərdə aparılan işlərə misal olaraq filoloq-alim, yazıçı Əzizə Cəfərzadənin 1970-ci illərdə "Azərbaycanın aşıq və şair qadınları" adı ilə nəşr etdirdiyi kitabında, əsrin sonlarında yazıçı Anarın "Min beş yüz ilin Oğuz şeiri", habelə "Azərbaycan şeiri antologiyası" toplularında şair Şahnigar xanım Rəncur barədə yığcam məlumat və əsərlərindən örnəklər verildiyini qeyd edə bilərik.

Son illərdə klassik Azərbaycan irsinin öyrənilm
fəaliyyət göstərən dəyərli alim, professor Mehmet Rıhtımın bu sahədəki zəhmətini xüsusi qeyd etməliyik. Belə ki, birlikdə üzərində işlədiyimiz və nəşr etdiyimiz Mirzadə Fəxrəddin Ağabalinin Mir Həmzə Nigarinin həyat və yaradıcılığına həsr etdiyi mənqibə tipli "Hümayi-Ərş" adlı əsərindən Şahnigar xanımın həyatı haqqında əldə etdiyi ətraflı məlumat və onun indiyədək məlum olmayan bir çox şeirlərinin üzə çıxarılması da apardığımız işin məzmununu zənginləşdirir. Şairə ilə bağlı son illərin sevindirici xəbərlərindən biri də Şahnigar xanımın məzarının Qiyasbəylilərin mülk kəndlərindən olan Ağköynəkdə ailə məzarlığında tapılması ilə bağlıdır.

Rəncurun ismətli, həyalı və möminə bir xanım olduğu üçün Qazax mahalında "Mollaxanım" ləqəbilə tanındığını qeyd edən Firidun bəy Köçərlinin şairin ailəsi barədə bildirdiklərinə görə, "Şahnigar xanım binti-Kazım ağa Qiyasbəyov Qazax şüərasının naziktəblərindən biri hesab olunur. Şahnigar xanım təvəllüd edibdir öz qəryələrində ki, Ağköynək adı ilə məşhurdur. İndiki Qazax şəhərinin yavuqluğunda xırdaca bir kənddir" [4, s.263].

"Hümayi-ərş"in müəllifi və Nigari ailəsinə yaxın bir ailənin övladı olan Mirzadə Mustafa Fəxrəddin də şairənin hicri təqvimlə 1265-ci ildə (miladi 1848/49) dünyaya gəldiyini, ancaq onun Ağstafa qəzasından Bayraqdarzadələrdən Abdullah bəyin kəriməsi, yəni qızı olduğunu qeyd edir: "Ağstafa qəzasından Bayraqdarzadələrdən Abdullah bəyin kəriməsidir. Bu zatın oğlu Ağabəy rus jandarma komandanlarındandır. 1305 tarixlərində Rəncur xanım bər-həyat imiş. Ağstafa şəhrinin Akgömlək məhəlləsindədir. 1305 tarixlərində qırx yaşlarında olmasına görə 1265 təvəllüdlüdür" [1, s.443-444]. Lakin qeyd etməliyik ki, Şahnigar xanımın Qiyasbəylilər nəslinə mənsub olması heç kimdə şübhə doğurmur, görüşüb ünsiyyət saxladığımız bu ailənin nümayəndələri həmişə Şahnigar xanım Rəncuru öz nəsillərindən hesab etmişlər. Bir faktı da söyləmək yerinə düşər ki, qeyd olunan Ağköynək (Akgömlək) kəndi hər zaman Qiyasbəylilərin mülkü hesab olunmuşdur. Çox ehtimal ki, müəllifin adını çəkdiyi Bayraqdarzadələr şairənin ərinin mənsub olduğu Şıxlılar (Şıxlılar Al Qazaq kökənlidir) soyunun qohumlarındandır. Tariximizə ayrı-ayrı nəcib ailələr və nəsillərin öyrənilməsilə işıq tutan məşhur araşdırmaçı-yazıçı Şəmistan Nəzirli şair Rəncurun əri Şəhriyar ağanın Şıxlılar nəslindən olduğunu, Ağstafanın girişində məscid tikdirdiyini (ilk sovet quruculuğu illərində sökülmüşdür) və gənc yaşlarında vəfat etdiyini bu yazının müəllifinə söyləmişdir. Əzizə Cəfərzadə isə fərqli şəkildə – onun Kazım ağa Qiyasbəylinin qızı, Paşa ağa Dilbazovun həyat yoldaşı və bu nikahdan bir qızı olduğunu söyləyir [3, s.100].

Firidun bəy Köçərli də Şahnigar xanımın çox gənc yaşlarında dul qaldığını, zövcü dünyadan köçdükdən sonra bir daha evlənmədiyini qeyd edir. “Azerbaycan

Yurt Bilgisi" jurnalındakı məqaləsində Mustafa Fəxrəddin onun bu izdivacdan Ağabəy adında bir oğlu da olduğunu qeyd etmişdir [2, s.24].

Əsl adı Şahnigar olan şairə şeirlərini "incik, narahat, dərdli, rəncidə" mənasını verən *Rəncur, Rəncuri*, *Mürdə ("Ölmüş") Rəncur*, *Xəstə Rəncuri*, *Şah Nigar* təxəllüsləri ilə yazmışdır. Firidun bəy Köçərli onun təbinin rəvan olduğuna, əksər yazdıqlarının münacat, mərsiyə, maddeyi-tarix və dostları arasında meydana gələn əsərlərdən ibarət olduğuna baxmayaraq, gözəllərin vəsfinə həsr edilmiş qəzəllər yazmadığına diqqət çəkir. Bunun səbəbi Şahnigar xanımın qarabağlı alim, şair Nəqşibəndi şeyxi Mir Həmzə Nigarinin müridlərindən olması idi. Şairə o zamanlar Amasiyada mühacirət həyatı yaşayan Şeyx Həmzə Mir Nigarini "ustadi kibarım" dediyi Hacı Mahmud əfəndi vasitəsilə tanımış və ondan inabət almışdır [1, s.444]. Bu barədə şairə qəzəllərinin birində deyir:

Necə təqrir edim vəsfin kamalı aləmə məşhur,
Camalı haqq-nüma bir mürşidi-kamil Nigarım var.
Siyəh-ru xəstə Rəncuram əlim daməni-pakında,
Nə qəm Mahmud əfəndi tək bir ustadı-kibarım var.

(Qeyd: məqalədə istifadə edilən şeirlərin əksəriyyəti tərəfimizdən ilk dəfə çap olunmaqdadır – müəllif.)

Ona çox yaxın olan bu iki əziz şəxsiyyət barədə bir çox şeirlərində açıq və gizli xatırlatmalar fikrin emosionallığını artırmışdır.

Qazaxda böyük nüfuz sahibi olan Hacı Mahmud əfəndinin nəsli bu günədək ulu babalarının Seyid Nigariyə yaxınlığı ilə fəxr edir. Fəxrəddin Ağabali Rəncur xanımın Hacı Mahmud əfəndi ilə münasibəti barədə yazır: "Hacı Mahmud əfəndiyə bağlanaraq fitri istedadı sayəsində az bir zamanda irfani olmuş kəsb etmiş və Həzrəti Pirin mürşidanə ruhaniyyətindən feyz almağa müqtədir olmuş Firdövsi-illiyyin cənnətinin bir hurisi imiş" [1, s.444].

Şahnigar xanım Nigari əfəndiyə qarşı qaibanə, ilahi bir məhəbbət bəsləmiş, əksər şeirlərini ona həsr etmişdir. Onun bu

pərəstişkaranə sevgisi bir müridin mürşidinə qarşı olan məhəbbəti, təslimiyyəti idi. Qeyd etdiyimiz kimi, əksər şeirlərində onun adını özünə təxəllüs götürən şeyxinə həsr etmiş bu “Leylayi-ərş” xanım öz pirinin tutduğu məsləkdə sabit olduğunu bəyan edərək, uluhiyyət və mənəviyyat aləmindən Füzuliyanə bəhs edir [6, s.13].

Kimdi fəryad-rəs, ey dil, rəbbi-ə’ladan qeyri,
Nə deyim birliyinə həmdü-sənadan qeyri.
Bəndeyi-ruyi-siyaham, qəddin aləmdə, nigar,
Qeyrə nisbət deməzəm nəxli-Tubadan qeyri.
Firqəti-vəslin ilə munca ki fəryad edərəm,
Kim edə nagah xəbəri badi-Səbadan qeyri.
Dil ki hər ruz çəkər ahına bin həsrətlə,
Nə bulur anda baxan türlü cəzadan qeyri.
Kim edər cürmi-şəha dəhridə məndən özgə,
Kim edər əfv dəxi Həyyi-bəqadan qeyri.
Əfüvvü-Rəhman eşidər fəth edə rəhmət babın,
Nə olur əbdin işi cürmi-xətadan qeyri.
Həm bizə Fatimədən onca şəfaət kim edər,
Kim tutar məhəbbəti ol huri-liqadan qeyri.
Ol qiyamətdə qamu ümməti Məhəmməd də dəxi,
Kim salar saya məgər həmdi-livadan qeyri.
Dəhridə Şah Nigar, xəstə Rəncuri sənin,
Nə qalar həzrətinə canı fədadan qeyri
[1, s.444-445].

...Firidun bəy Köçərli Şahnigar xanım Rəncurun şeirlərinin sayının 200-ə çatdığını, divanı varsa da səhifələrinin dağınıq halda olduğunu qeyd edir. Həmçinin Rəncurun “Azərbaycan ədəbiyyatı” kitabına daxil etdiyi şeirlərini bir dəftərdən köçürdüyünü, o dəftərdə şairənin “münacat və qəzəliyyatından məadə bir neçə rübailəri, müxəmməs, müsəddəs və saqinamləri”nin aydın, oxunaqlı bir xətlə yazıldığını diqqətə çatdırır [4, s.265]. Çox təəssüf ki, bir çox şeirlərinin məzmununun eyni olduğunu əsas gətirərək

dəftərdəki şeirlərdən sadəcə bir qismini – diqqətini cəlb etmiş 62 beyti kitabına daxil etmişdir.

Yuxarıda sadaladığımız mənbələr, eyni zamanda Şahnigar xanımın Mir Həmzə Nigariyə bəslədiyi məhəbbəti ifadə edən bir hekayə nəql edir. Bu rəvayət Qazax əhalisi arasında indiyədək danışılmaqdadır. Deyilənə görə, Şahnigar xanım Nigari həzrətlərinə qarşı ifratkar sevgisini ifadə etmək üçün ona öz əli ilə bir səccadə toxumuş, üzərinə də pirinə həsr etdiyi şeiri işləmişdir. Bu hadisəni Mirzadə Fəxrəddin belə nəql edir: "Qəlbində daşıdığı atəşi-məhəbbətin nümunəsi olmaq üzərə kəndi əliylə bir səccadə dokumuş və üzərinə kəndi zadəyi-təb'ı olan bir beyti işləmiş və cənabı-rəşadət-məabı-mürşidi-əkrəmləri hüzuruna göndərmiş, hissi-qəbulu ricasını mutazammın ədibanə bir məktub təqdim etmişdir" [1, s.444]. Şeyx Həmzə Nigari bu hədiyyədən çox təsirlənmiş, sevinmiş, bütün ömrü boyu o səccadə üzərində namaz qılmışdı. Vəfatından sonra bu qiymətli hədiyyə ikinci zövcəsi, Amasiyada evləndiyi Lütfiyyə xanım tərəfindən Trabzonda saray xanımlarından birinə bağışlanaraq əldən çıxarılmışdır [2, s.24]. Səccadənin üzərinə yazılmış şeir təsbit edilməmişsə də, şeyxin təsirlənərək təşəkkür mahiyyətində cavab olaraq yazdığı beytlər hədiyyənin nə dərəcədə qiymətli ("töhfeyi-pirayə") olduğunu göstərməyə kifayət edir:

Nigarı-nazəninim fərşi-bəzm-arayə göndərmiş,
Nigarın eyləmiş rəng-tərin şeydayə göndərmiş.
Rəvac olsun deyərdim hüsni bazari-məlahətdə -
Ki, rəngin aşiqi-şeydasinə sərmayə göndərmiş.
Gözəl nəqşü-nigarin eyləmiş, zibatərin yazmış,
Müzəyyən müshəfi-ruxsardən bir ayə göndərmiş.
Məgər şuridəsin yar eyləmiş kim Şahnigarım tək,
Fərah-əfza o dil-ara töhfeyi-rənayə göndərmiş.
Degil biməna bu ikramı-ziba ol sənəm-sima,
Əmir Həmzəyə əlbəttə bir mənayə göndərmiş.
Gözüm pürnur olur baxdıqca, könlüm açılır guya,
Hədiyyə pərtövi-şəmsi-ruxindən ayə göndərmiş.
Ziyad olsun dəmadəm iltifatı ol gözəl namın,

Nigarım tək kərəm dəryasını biqayə göndərmiş.
Kərəm dəryasıdır, bir dövləti-bipayə malikdir,
Sərapa lütfdür kim, töhfeyi-pirayə göndərmiş.
Yenə sövdayə düşmüş, aşiqanə bir qəzəl yazmış,
Nigari bir qəzəlnamə büti-zibayə göndərmiş.
Əcəb xoşnud olurmu iltifatımdan deyü sovqat,
Kərəm qılmış nigaranə bəni-rüsvayə göndərmiş
[4, s.265].

Beləliklə, cavab olaraq yazılan bu şeir-məktub, əlbəttə, üzdən aşiqanə təsir buraxan “büti-ziba”, “nigari-nazənin”, “nigaranə” ifadələrinə baxmayaraq, imanların batini gözəlliyini və bu iki dostun münasibətlərinin saflığı, paklığı fonunda mənəvi-əxlaqi keyfiyyətlərini səciyyələndirən bir vasitə dəyərində çox mənalıdır.

Qaynaqların qıtlığı şəraitində Mirzadə Fəxrəddin vasitəsilə əldə olunan hər kiçik məlumat belə şairənin portretini tam cıza bilmək baxımından dəyərlidir. Bu mənada tədqiqatçının “Hümayi-ərş”də şairənin şeirlərini onun öz əlyazısı ilə yazdığı kağızlardan və “Divan”ından köçürdüyü qeydləri bizim üçün əhəmiyyətlidir və

şairənin ədəbi fəaliyyəti barədə təsəvvürlərimizin bütünləşməsinə, genişlənməsinə kömək edir [1, s.444].

Şahnigar xanımın əlimizə keçən şeirlərini diqqətlə incələdikdə onun Şeyx Nigari ilə davamlı olaraq məktublaşdığı aydın olur. Çünki Nigarinin də şeirləri arasında Rəncur xanıma cavab şəklində, yaxud əksinə, onun özünə ünvanlanmış beytlərinə rast gəlirik:

Kitabın ol şahənşahın bana kim qıldın ərzani,
Nider min ba'd gönlüm, ey əzizim, mali-dünyani.
Dikərdi rahı-dərmana gözün dil bin niyaz ilə,
Bu gün əlhəmdü-lillah kim yetirdün dərdə dərmani.
Giriftar ola bin dərd içrə canım badəha xovfu,
Əcəldən etməzəm çün içirdün abi-heyvani.
Muqim olgil sərirində təriqi-Nəqşibənd üzərə,
Nazil olsun sana hərdəm Haqqın bin fəzlü-ihsani.
Həbiba, dər cihan daim mütəhhər cismin içində,
Ola ayineyi-könlün nəzərkərdeyi-Rəhmani.
Nə türfə mahi-vüsal içrə nə xub göndər ki, lütf etsin,
Firavan iltifat eylə bana, ey canımın cani.
Nə xoş saətdə yaratdın nə ziba ərmağan ilə,
Əkübsən xəstə Rəncuri gibi bir kəlbi-ərnani
[1, s.450].

Bu qəzəl Rəncur xanımın Hacı Mahmud əfəndi tərəfindən ona hədiyyə edilmiş Həzrəti Pirin "Divan"ı üçün təşəkkürüdür [1, s.450].

Yaxud:

Sanma kim candan, Nigara, dərdi-pünhanım çıxar,
Qılmasan feyzi-nəzər dilimdən suzanım çıxar.
Aləm içrə ol münəvvər mahi-ruyin görməsəm,
Saqiya, hicranla min cani-nadanım çıxar.
Qafil olma, ey könül, sən gözlə rahın hər zaman,

Seyr edər hər dəm Qazaxa şahi-sultanım çıxar.
Xəstə Rəncuri der bu nameyi-aşüftədən,
Sən özün əfv eylə, ya rəbb, hər nə nöqsanım çıxar
[1, s.446].

Həmzə Nigaridən aldığı saf istəklərin tərcüma cavabları da həmin ruhda idi:

Cüda düşdüm ellərindən,
Kəsmədim göz yollarından.
Zülfi-Leyla əllərindən
Gəzdim divanə-divanə
[5, s.106].

Rəncurun şeirləri kimi məktublarında da həq mənaların qovuşması ilə ifadə olunan fikir coşqun poetik bədiiliyə xidmət etməklə oxucularda yüksək mənəvi aləmin ecazkar mənzərələrini yaratmağa səbəb olur.

Köçərlinin qeyd etdiyi kimi, şairə bir qəzəlində artıq öz mürşidi-kamili olan Nigarinin məhcəmalını görüb, dərgahi-pakına üz sürtmək, əl-ayağını öpmək, bülbül kimi gecələr sübhədək kuyində nalə etmək və müridləri dairəsində "hu-hu" deyib məstü-laübali olmaq ona müyəssər olmadı... [4, s.264].

Bir oxucu üçün Rəncur yaradıcılığında diqqə cəhətlər çoxdur; Şahnigar xanımın əldə olan şeirlərinə əsasən demək mümkündür ki, bu nümunələrdə istedadla ilhamın fövqəladə uyuşması göz önündə canlanır. Bu Məcnun ruhlu nəcib xanımın şeirləri arasında "Çıxar", "Saqi", "Nədən", "Yox", "Var", "Vardır", "Geç", "Ağlağıl", "Mən", "Bilməm", "Qeyri" rədifli qəzəlləri onun bu şeir sənətini Məhəmməd Füzuli kimi sələflərindən miras aldığını, şeirlərin dil-üslub keyfiyyətlərinin mükəmməlliyi isə bu mənbələrin əbədi gücünü göstərir. Firidun bəy Köçərli onun çox da elmli olmadığını, lakin təbinin güclü olduğunu söyləsə də, bilirik ki, əruzun dəvə ləngərinə bənzər ölçülü-biçili vəznlərində şeir yazmaq üçün quruca təb kifayət etməzdi. Ola bilsin ki, Firidun bəy dünyəvi elmləri nəzərdə tutaraq bu qənaətə gəlmiş, halbuki özü Şahnigar

xanımın tərcümeyi-halından bəhs edən yazısının əvvəlində onun Qazaxda “Mollaxanım” ləqəbilə tanındığını qeyd etmişdi [4, s.263]. Doğrudur, bu ləqəbin verilməsində Şahnigar xanımın dindarlığı əsas amil ola bilər, amma camaat hər dindar qadını da “Mollaxanım” adlandırmazdı. Fikrimizcə, Şahnigar xanım Rəncur dini elmlərə, islam tarixinə, təsəvvüfə dərindən vaqif olmuşdur. Bu qənaəti Mir Həmzə Nigarinin müridi olması, habelə onun qiyabi də olsa, maraqlı müsahibi olması faktını qüvvətləndirməkdədir. Onun ərəb-fars dillərini bilməsi də böyük ehtimal daxilindədir. Bu dillərdə yazdığı haqqında əlimizdə bir məlumat olmasa da, klassik janr üslubuna, dilinə yaxından bələd olduğunu şeirlərində ərəb qrammatikasının *fail-məful* formalarında əmələ gələn subyekt-obyekt qarşılaşdırmasında aydın görə bilərik:

Nədir talib, nədir mətlub,
Nədir rağib, nədir mərğub,
Nədir cazib, nədir məczub,
Nə zənn olsa, cinanəm mən…
[4, s.267].

Şair burada müqayisə və bədiiliyi təm
vasitələrdən istifadə etməmiş, bənzətmə ədatlarından belə yan keçmiş, sanki poetik fikrin açıq, örtüsüz ifadəsindən yayınmış, məsələni suallar formasında qəti şəkildə səsləndirməklə, əksinə, fikrin daha ecazkar ifadəsinə nail olmuşdur.

Firidun bəy Köçərlinin qeyd etdiyi kimi, Şahnigar xanımın qəzəliyyatı, əsasən, Mir Həmzə Nigariyə həsr olunmuşdur. Onun bədii irsi bəzi ənənəvi çalarlardan məhrumdur. Belə ki, şairin gözəlin – məşuqun vəsfinə dair aşiqanə şeirləri yoxdur. Bu səbəbdən şairə bədii irsimizə zəngin obrazlılıq silsiləsi əlavə etmişsə də, əsərlərinin məzmunu ciddi və rəngsizdir. Hətta şeirlərini incələdiyimizdə aydın olur ki, müəllif Fərhad, Leyla, Məcnun kimi ənənəvi ümumşərq obrazları ilə yanaşı, nəcabətli isimlərdən – dini şəxsiyyətlərin adlarından da bədii məqsədlərlə istifadə etmişdir:

Bihəmdillah, mən də bir qulam, Pərvərdigarım var,

Nəbim muxtar Əhməddir, kənizəm çaryarım var.
Günahım gərçi əksərdir, nə qəm vardır ki, haqda,
Əbubəkir, Ömər, Osman, Əli tək lütfkarım var.
Çehar yarə qarşı ol kəramət taxtı üstündə,
Həsən namında bir şahım, Hüseyn tək şəhriyarım var.
Dəri-dövlətdə Zeynəlabidin və Bagir və Sadiq,
Dəxi Musa ilə Kazım və Rıza tək şahsuvarım var.
Və pənahım ol Tağı əkbər, Nağı, Mehdi, həm Əsgər,
İmam on iki sərvər nədən ey dil, nizarım var
[1, s.449-450].

Yuxarıdakı beytlərdən də məlum olur ki, şairə p yüksək mənəvi aləmin töhfələrini şeirlərinə köçürmüş, bugünkü məzhəb təəssübkeşlərinə belə örnək ola biləcək vahid islam düşüncəsinə sahib olmuş, mürtəce şiə-sünni ixtilafına əsla yer verməmişdir.

Şeirlərinin əsas ilham mənbəyi olan şeyxinə qəzəllər həsr edən bu zərif təbli, incə zövqlü şairə Məcnunundan ayrı qalmağa taqəti qalmamış, üzünü saqiyə tutaraq demişdir:

Kəsilüb taqəti-tabım tutuldu dizlərim saqi,
Qalub bin intizar ilə bu yolda gözlərim saqi.
Rəhi-eşqində əş’arı bana ruzi qılub Tari,
Sənin şanın səzavərdi olurmu sözlərim saqi.
Nigara, xəstə Rəncuram, səninlə çeşmi-pür-nuram,
Dərində könlü məmuram, utanur yüzlərim saqi
[1, s.447].

Nümunələrdən də göründüyü kimi, “saqi” özünün həqiqi mənasında işlənmədiyi kimi, şairənin şeirlərində də həqiqi eşqi deyil, sufilərin məcazi, lakin böyük eşqini tərənnüm edir. O eşqi ki Yunus Əmrəni çöllərə salmış, Nəsimini dara çəkdirmiş, Nigarini vətənindən dərbədər etmişdir. Məhz bu baxımdan eşqin və aşiqin (şahın) tərənnümü fonunda həyatın təzadları, ictimai kontrastlar və fəlsəfi düşüncələr şairin şeirlərində açıq şəkildə əks etdirilir:

Aşiqin peyvəstə, şahım, biqərar olmaq nədən,
Gahi bihuş, gahi dərguş, gahi kar olmaq nədən.
Gahi xəndan, gahi xürrəm, gahi pür-qəm, gahbegah
Alışub başdan-ayağa küli-nar olmaq nədən.
Guşeyi-firqətdə aşiq gah sərdi-ah ilə,
Gahi cismi-natəvani dağdar olmaq nədən.
Söylə ey müşkül-güşa bin ah dili-suzan ilə,
Aşiqin aləmdə dərdi səd hezar olmaq nədən.
Dəmbədəm dərdi-nihanı aşiqi-dilxəstənin,
Ey gözüm, nuru cahanda aşikar olmaq nədən.
Ərzi-didar ilə can vermək dilərkən daima,
Hər zaman məşuqdan aşiq kənar olmaq nədən.
Tövbə qıl min ba’d deyirlər yoxdu hikmətdən sual,
Xəstə Rəncuri sualın munca var olmaq nədən.
[1, s.448-449].

Əlbəttə, söz, sənətkarın qələmində elə bir vasitədir ki, onunla şair adi bir cismi, yaxud bəsit bir hadisəni poetik obraz səviyyəsinə

qaldıra bilər. Rəncur da "dərində könlü məmurəm, yüzüm isə utanır", – deməklə öz halını – zahirinin bir abır-həya, məsum utancaqlıq örtüyünə büründüyünü dilə gətirir. Təsadüfi deyil ki, şairin bədii irsi ana dili qaynaqlarından güc almış "canımın canı", "özünə yar eyləmək", "yeni sevdaya düşmək", "sidq ilə yalvarmaq", "dərgahına üz qoymaq" və s. bu qəbildən olan xəlqi, el dilində olan ifadələrlə keçmiş bədii irsimizə zəngin bir obrazlılıq silsiləsi əlavə etməkdə şair və vətəndaş dəyanətini, bütövlüyünü çatdırmaqdadır.

Firidun bəy Köçərli Şahnigar xanımın yaradıcılığından bəhs edərkən onun rübailərinin də olduğunu qeyd etmiş, lakin kitabında bu rübailərdən heç bir nümunə dərc etməmişdir. Tədqiqatlar zamanı Mirzadə Fəxrəddinin "Hümayi-ərş"ində şairənin bir neçə rübaisinə rast gəldik:

Sən çəkmə əlin saqidən, ey xəstə Rəncur,
Daim anın ali nəsəbindən dilə mənzur.
Çün eylər anın nəzmi dəxi dilləri məmur,
Bu misrayi-isneyni dəmadəm eylə məzkur.

Və ya,

Həmd eylə haqqın birliyinə, ey dili-bimar,
Yüz şükr ki, aləmdə qılıb lütfünü izhar.
Pərvanə edüb, ey mürği-könül kuyinə səyyad,
Dərgahına yüz qoy bunu de, sidqilə yalvar
[1, s.446].

Nəzərə çatdırmaq istərdik ki, Mir Həmzə Nigari üçün mənəvi rəhbər olmaqla yanaşı, həm də qüsursuz örnək sənətkar, qələm sahibi olmuşdur. Belə ki, Şahnigar xanım həmçinin bütövlükdə öz bədii yaradıcılığında müəlliminin ədəbi dəsti-xəttindən təsirlənmişdir. Bildiyimiz kimi, Nigari əfəndinin misranın əvvəlində, ya sonunda poetik təkrarlarla müşayiət olunan şirinməzac şeirləri çox məşhurdur. Vird və zikr məclislərində oxunan bu səliqəli-sığallı, ritmik şeirlər oxucunun hafizəsində silinməz təsir buraxıb dinləyiciləri uzun müddət öz cazibəsində

saxlayardı. Şahnigar xanımın xoş və fərəhli duyğular oyadan şeirləri müasirləri tərəfindən də rəğbətlə qarşılanır:

Ol dəm ki, bən səndən cüda, biganə mən, biganə mən,
Olsam əcəbmi, ey gözüm, divanə mən, divanə mən.
Ey can ki, məndən bu cahan heyfa ki, həm zuhur olub,
Can vermədim, can vermədim, mərdanə mən, mərdanə mən.
Fərhadvəş səndən cüda bu aləmə salmış səda,
Olsam əcəb düşsəm əgər əfganə mən, əfganə mən.
Düşdüm qəmi-zaman ilə hər ləhzə ki fəğan ilə,
Bu dideyi-giryan ilə hicranə mən, hicranə mən.
Gözyaşımı ümman ilə, gül yüzümü tufan ilə,
Seyr eylədim Məcnun gibi hər yanə mən, hər yanə mən.
Sürdüm yüzüm dərgahına, qıldım səna Allahına,
Ərz eylədim əhvalimi sultanə mən, sultanə mən.
Hərçənd ki, qüsurluyam, mən bu dərgahın quluyam,
Acizəm, yetim Rəncuriyəm, loğmanə mən, loğmanə mən
[1, s.453].

...Ədəbiyyatımızın indiyədək qapalı səhifələrindən və naməlum şəxsiyyətlərindən sayılan Şahnigar xanım Rəncur özünün bariz keyfiyyətləri ilə bir şair olmaqla bərabər, həm də klassik poeziyamızın lirik qəhrəmanına bənzəyir; o, həm zahiri, həm də daxili-əxlaqi gözəlliyi ilə bu gün də oxucusunu heyran etməkdədir. Böyük ehtimalla deyə bilərik ki, Rəncur, İsmayıl Şıxlının “Dəli Kür” əsərində parlaq, lakin həm də faciəvi obraz olan Şahnigarın (Cahandar ağanın bacısı) prototipidir. Onun həyatının bir çox mühüm faktları: erkən dul qalması, eyni soya yaxınlığı, adı (Rəncur Şıxlıların gəlini idisə, “Dəli Kür”dəki Şahnigar obrazı birbaşa Şıxlı soyundandır) və s. oxşarlıqlar bizə bunu deməyə əsas verir.

## Nəticə / Conclusion

Uzun zaman mübahisələrə səbəb olan Seyid Mir Həmzənin Nigari təxəllüsünün haradan götürülməsi, onunla Şahnigar Rəncur arasında olan platonik münasibət, bu hadisələrin yazıçı İsmayıl Şıxlının “Dəli Kür” əsərilə bədii təqdimi və s. kimi məsələlərin məqalədə öz əksini tapdığını güman edirik. İnanırıq ki, ədəbiyyatımızın bilinməyən səhifələrindən biri hesab edilən şairə Şahnigar Rəncur haqqında araşdırmalar davam edəcək və bu axtarışların nəticəsində söz xəzinəmiz dolğunlaşacaq, Nizami və Füzuliyə bağlanan böyük mədəni-fəlsəfi irsimiz bir az da zənginləşəcəkdir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Cəfərzadə Ə. (1991). Şahnigar xanım Rəncur – Azərbaycan aşıq və şair qadınları. Bakı, Gənclik. 100-102 s.
2. Köçərli F. (2005). Şahnigar xanım "Rəncur" – Azərbaycan ədəbiyyatı (iki cilddə), II cild. Bakı, Avrasiya Press. 263-268 s.
3. Paşayeva Q. (2012). "Bəzmi-səmadan keçməzəm...". I Beynəlxalq Həmzə Nigari simpoziumu, Amasiya. 11-32 s.
4. Min beş yüz ilin Oğuz şeiri. (1999). I kitab. Bakı, "Azərbaycan" nəşriyyatı.
5. Nuriyeva Təkləli M. (2017). Nigarinin ideya-məslək ortağı Xasay xan Usmiyevin XIX əsr Qafqaz – Azərbaycan mühitində yeri. III Beynəlxalq Həmzə Nigari Türk dünyası mədəni irsi simpoziumu, Şamaxı, 17-18 may. 65-72 s.
6. Mir Həmzə Seyid Nigari. (2010). Divan. (Nəşrə hazırlayan Nəzakət Məmmədli). Bakı, "Elm və təhsil" nəşriyyatı.
7. Mirzadə Mustafa Fəxrəddin Ağabali. (2014). Hümayi-ərş. Qarabağlı Şeyx Mir Həmzə Nigarinin mənqibənaməsi. Bakı, Nurlar.
8. Müctəhidzadə Məhəmməd ağa. (1995). Riyazül-aşiqin. Bakı, "Azərbaycan" nəşriyyatı.
9. Mümtaz S. (2006). Azərbaycan ədəbiyyatının qaynaqları. Bakı, Avrasiya Press.
10. Mir Möhsün Nəvvab. (1998). Təzkirey "Azərbaycan" nəşriyyatı.
11. XX əsr Azərbaycan şeiri antologiyası. (20 Qərb" yayım evi.
12. Caferoğlu A. (2008). Azerbaycan Yurt Bilgi Kurumu Yayımları.
13. Rıhtım M. (2012). Fahrettin Ağabalinin " eserinde Mir Hamza Nigari ile alakalı bilgi ve belgeler. I Uluslararası Hamza Nigari sempozyumu, Amasya. 197-174 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 1 (275), 130-141
doi.org/10.48445/c3855-0591-0168-p

**Ə D Ə B İ M Ü H İ T**

# Uşaq və gənclərin misilsiz sərvət və güc mənbəyi olan milli-mənəvi dəyərlər ruhunda tərbiyəsi

***Kəmalə Əliyeva***
234 №-li tam orta məktəb, Azərbaycan dili və ədəbiyyat müəllimi, Əməkdar müəllim. Azərbaycan. E-mail: kemale.eliyeva72@mail.ru
https://orcid.org/0009-0001-2802-9943

**XÜLASƏ**
Məqalədə bəşər tarixində özünəməxsus adət-ənənələri, yüksək mənəvi keyfiyyətləri ilə seçilən Azərbaycan xalqının minillik dərin köklərə malik milli-mənəvi dəyərlərinin təbliğ olunmasından söz açılır. O cümlədən məktəblərdə şagirdlərin – yetişməkdə olan gənc nəslin türk soylu, islam etiqadlı, müasir düşüncəli, cəmiyyət üçün dəyərli vətəndaş kimi formalaşması və inkişafı üçün onların məhz milli-mənəvi dəyərlər ruhunda tərbiyə olunmasının zəruriliyi vurğulanır.

**AÇAR SÖZLƏR**
milli-mənəvi dəyərlər, ana dili, milli ədəbiyyat, adət-ənənə, tərbiyə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.02.2023
qəbul edilib: 10.03.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 1, VOL. 275, 130-141
doi.org/10.48445/c3855-0591-0168-p

**LITERARY ENVIRONMENT**

# Education of children and young people in the spirit of national and moral values, which are an unparalleled source of wealth and power

***Kamala Aliyeva***
Secondary school No. 234, Azerbaijani language and literature teacher, Honored teacher. Azerbaijan. E-mail: kemale.eliyeva72@mail.ru
https://orcid.org/0009-0001-2802-9943

**ABSTRACT**
The article talks about the promotion of the millennial deep-rooted national and spiritual values of the Azerbaijani people, one of the oldest nations in the world, distinguished by its rich system of national, moral and spiritual values, unique customs and traditions, high morality. The author emphasizes the need to educate students in the spirit of national and spiritual values for the formation and development of students in schools - the younger generation of Turkish descent, Islamic faith, modern thinking, as a valuable citizen for society.

**KEYWORDS**
national-moral values,
native language,
national literature,
customs,
national values

**ARTICLE HISTORY**
Received: 05.02.2023
Accepted: 10.03.2023

## Giriş / Introduction

Xalqımızın milli-mənəvi dəyərlərinin minilliklərə dayanan dərin kökləri vardır. Azərbaycan xalqı dünyanın ən qədim xalqlarından biri kimi bəşər tarixində özünün zəngin milli, əxlaqi və mənəvi dəyərlər sistemi, özünəməxsus adət-ənənələri, yüksək mənəviyyatı ilə seçilmişdir. Min illər boyu formalaşan və Azərbaycan xalqının yüksək mənəvi dəyərlərə malik olduğunu göstərən bu adət-ənənələr millətimizin keçmişi, bu günü və gələcəyi arasında sarsılmaz mənəvi körpü rolunu oynayır. Xalqın milli dəyərlərini hər zaman yüksək qiymətləndirən ümummilli liderimiz Heydər Əliyev demişdir: “Milli adət və ənənələr hər bir xalqın milli mədəniyyətinin zənginliyindən, qədim tarixi kökə malik olmasından xəbər verir”.

Milli-mənəvi dəyərlərimiz türk soylu, islam etiqadlı, müasir düşüncəli insan formalaşdıran, onun cəmiyyət üçün dəyərli vətəndaş kimi inkişafına xidmət edən davranış qaydalarıdır.

Xalq bütün dövrlərdə mütərəqqi adət və ənənələrin – milli-mənəvi dəyərlərin yaradıcısı olmuş, eyni zamanda onu qoruyub zənginləşdirmişdir. Xalqımızın şanlı tarixi, canlı dili, müqəddəs dini, gözəl adət-ənənələri, mədəniyyəti, ədəbiyyat və incəsənəti ali bəşəri hissləri təbliğ edən dəyərlər kimi milli-mənəvi simamızın aynası hesab edilir. Bu dəyərləri ən qiymətli miras kimi qoruyaraq gələcək nəsillərə ötürmək hər bir vətəndaşın, o cümlədən yetişməkdə olan nəslin təlim-tərbiyəsi ilə məşğul olan müəllimlərin ən ümdə vəzifələrindəndir.

Hər bir millətin varlığını mühafizə etməsi, adət-ənənələrini yaşatması, onun əsrlər boyu yaratdığı zəngin mədəni irsini və mənəvi dəyərlər sistemini gələcək nəsillərə ötürə bilməsi, ilk növbədə, ana dilini qoruyub saxlaya bilməsindən asılıdır. Çünki bu dil xalqın ruhunun aynası kimi milli-mənəvi dəyərlər xəzinəsinin ən qiymətli incisidir. Görkəmli şairimiz Bəxtiyar Vahabzadənin sözləri ilə desək:

Məni həm babamla, həm də nəvəmlə

Bağlayıb uzanan tarix bağımsan.
Dünənim, sabahım, üstəlik hələ
Mənim söz hünərim, söz bayrağımsan.

Bu tarix bağının qırılmaması üçün dünənimiz, bu günümüz və sabahımız arasında polad körpü rolu oynayan ana dilimizin saflığını qorumalıyıq. Azərbaycan öz müstəqilliyini əldə etdiyi ilk günlərdən bu önəmli məsələyə xüsusi diqqət yetirilmişdir.

İstər doğma dilini bilməyənləri “şikəst” adlandıran ümummilli liderimiz Heydər Əliyevin, istərsə də onun layiqli davamçısı İlham Əliyevin hakimiyyəti illərində məqsədyönlü dil siyasəti aparılmış, bu istiqamətdə vacib sənədlər imzalanmışdır:

- “Azərbaycan Respublikasında dövlət dili haqqında” Azərbaycan Respublikasının Qanunu (22 dekabr 1992-ci il);
- Azərbaycan Respublikası Kostitusiyasının “Dövlət dili” adlanan 21-ci maddəsi;
- “Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında” Azərbaycan Respublikası Prezidentinin Fərmanı (18 iyun 2001-ci il);
- “Azərbaycan əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında” Azərbaycan Respublikası Prezidentinin Fərmanı (9 avqust 2001-ci il);
- “Azərbaycan Respublikasında dövlət dili haqqında” Azərbaycan Respublikasının Qanunu (30 sentyabr 2002-ci il);
- “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında” Sərəncam (23 may 2012-ci il);
- “Azərbaycan Milli Elmlər Akademiyasının Nəsimi adına Dilçilik İnstitutunun maddi-texniki bazasının gücləndirilməsi haqqında” Sərəncam (29 may 2012-ci il);
- “Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Terminologiya Komissiyası haqqında Əsasnamə”nin təsdiq edilməsi barədə” Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı (26 noyabr 2012-ci il);
- “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı”nın təsdiq edilməsi haqqında Sərəncam (9 aprel 2013-cü il);
- “Azərbaycan dilinin elektron məkanda daha geniş istifadəsinin təmin edilməsi ilə bağlı bir sıra tədbirlər haqqında” Sərəncam (17 iyul 2018-ci il);
- “Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər

haqqında" Azərbaycan Respublikası Prezidentinin Fərmanı (1 noyabr 2018-ci il).

Bütün bu sənədlər, eləcə də "Əcnəbilər üçün Azərbaycan dilinin elektron platforması" layihəsinin tətbiqi ana dilinə dövlət qayğısının bariz nümunəsidir.

**Milli-mənəvi sərvətimizin təbliği**

Ümummilli liderimiz Heydər Əliyev demişdir: "...Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı – Azərbaycan dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıyıq". Bu sözlər milli-mənəvi dəyərlərimizin qorunması və təbliği istiqamətində fəaliyyətimizin əsas aspektlərini vurğulayaraq hər birimizə aydın yol göstərir.

Ümumtəhsil məktəblərində V sinifdən başlayaraq XI sinfə kimi şagirdlərin şifahi və yazılı nitq vərdişlərini inkişaf etdirmək məqsədilə iş aparılır. Bu işlər həm gündəlik dərslər, həm də sinifdənxaric tədbirlər zamanı həyata keçirilir. Bu baxımdan şagirdlərin varvarizm və vulqarizmlərdən istifadə etməmələri, ədəbi dilin fonetik, leksik və qrammatik normalarına əməl etmələri, dilin incəliklərinə bələd olaraq frazeoloji birləşmələrdən, idiom və ibarələrdən, eləcə də aforizmlərdən yerində və düzgün istifadə etmələri, nitq mədəniyyətinin tələblərinə əməl etmələri əsas meyar kimi qarşıya məqsəd qoyulur. Məktəb kitabxanasında keçirilən mütaliə saatlarının bu baxımdan əhəmiyyəti böyükdür. Hər il 21 Fevral – Beynəlxalq Ana Dili Günü münasibətilə müxtəlif formalı tədbirlər: inşa və şeir müsabiqələri, ədəbi-bədii musiqili gecələr, poeziya axşamları, bədii qiraət gecələri, "Breyn-rinq" yarışmaları və s. keçirilir. Şagirdlər ilə "Ana dilim şirindir", "Danışmaq və dinləmək mədəniyyəti" mövzusunda diskussiyalar aparılır. Bu zaman dilimizin tarixi kökləri, zəngin lüğət tərkibi haqqında şagirdlərə məlumat verilir, müxtəlif elm, ədəbiyyat və mədəniyyət xadimlərinin dilimizə verdikləri qiyməti əks etdirən aforizmlər səsləndirilir. Bununla da bir müəllim olaraq böyük şairimiz Bəxtiyar Vahabzadənin müqəddəs arzusunu həyata keçirməyə çalışıram:

Bu dil, – bizim ruhumuz, eşqimiz, canımızdır,
Bu dil, – bir-birimizlə əhdi-peymanımızdır.
Bu dil, – tanıtmış bizə bu dünyada hər şeyi.
Bu dil, – əcdadımızın bizə qoyub getdiyi
Ən qiymətli mirasdır, onu gözlərimiz tək
Qoruyub, nəsillərə biz də hədiyyə verək.
[Vahabzadə B. Bakı, 2004].

Ana dilimizin təbliği qədər tariximizin, incəsənətimizin, mədəniyyətimizin, eləcə də onun bir parçası olan qədim tarixə malik ədəbiyyatımızın öyrənilməsinə və təbliğinə də xüsusi diqqət yetirilməlidir.

Bu, həm ədəbiyyatımızın tədrisi, həm də müxtəlif ədəbi nümünələrdə təbliğ olunan müsbət insani keyfiyyətlərin – düzlük, saflıq, mənəvi ucalıq, vətənpərvərlik, insanlıq, alicənablıq, xeyirxahlıq, dostluq, namus, qeyrət, milli mənlik, milli birlik və s. hisslərin şagirdlərə aşılanması baxımından böyük əhəmiyyət kəsb edir. Məhz bütün bunların kontekstində Azərbaycan vətəndaşının varlığı göstərilir.

Azərbaycan Respublikası Konstitusiyasının 16-cı maddəsinin II bəndində göstərilir ki, “Azərbaycan dövləti mədəniyyətin, təhsilin, səhiyyənin, elmin, incəsənətin inkişafına yardım göstərir, ölkənin təbiətini, xalqın tarixi, maddi və mənəvi irsini qoruyur” [Azərbaycan Respublikasının Konstitusiyası və hüququn əsasları].

Bu müqəddəs missiyanı həyata keçirənlər sırasında Azərbaycan dili və ədəbiyyat müəllimi kimi bizlərin də üzərinə böyük vəzifələr düşür. Azərbaycan ədəbiyyatını şagirdlərə sevdirməklə onlarda xalqımıza, xalqımızın misilsiz sərvəti, güc mənbəyi olan milli-mənəvi dəyərlərə hörmət və sevgi aşılamış oluruq.

Hələ qədim dövrlərdən başlayaraq müasir dövrə qədər müxtəlif ədəbi nümunələrdə Azərbaycan xalqının milli-mənəvi sərvətləri, ailə dəyərləri öz əksini tapmışdır. Xalqımızın ən dəyərli söz abidəsi sayılan, qəhrəmanlıq, igidlik, mərdlik, cəsurluq, dostluq, birlik dastanı olmaqla yanaşı, həm də namus, qeyrət, ləyaqət, insanpərvərlik kimi əxlaqi, milli-mənəvi dəyərlərlə zəngin böyük

tarixi abidə olan “Kitabi-Dədə Qorqud” dastanında ailə dəyərlərinə xüsusi önəm verilmişdir. Dastanın müqəddiməsində verilmiş:

“Qız anadan görməyincə öyüd almaz,
Oğul atadan görməyincə süfrə yaymaz”
[Kitabi-Dədə Qorqud. Bakı, 2004]

– kəlamı bir tərəfdən ata-oğul, ana-qız münasibətlərinə güzgü tutursa, digər tərəfdən uşağın tərbiyəsində valideynin şəxsi nümunəsinin, valideyn nüfuzunun vacibliyini vurğulayır. Dastanda ana haqqının Tanrı haqqına bərabər tutulması, ağsaqqala, ağbirçəyə hörmət edilməsi, Qazılıq Qoca oğlu Yeynəyin atasını, Uşun Qoca oğlu Səgrəyin qardaşı Əgrəyi, Uruzun atası Salur Qazanı kafir əsirliyindən azad etmək üçün döyüşmələri, atası Dirsə xanın bir müddət əvvəl yalanlara uyaraq onu oxlamasına baxmayaraq, Buğacın onu qurtarmaq üçün xəyanətkarların üstünə təkbaşına getməsi bir tərəfdən xalqımızın qəhrəmanlıq əzmini əks etdirirsə, digər tərəfdən ailə bağlarının nə qədər möhkəm olduğu təəssüratını yaradır. Dastanda “Ana haqqı – Tanrı haqqı” sayılır ki, bu da oğuz türkləri üçün ananın nə qədər müqəddəs və əziz olduğunu, bir yaradıcı kimi Tanrıya bərabər tutulduğunu göstərir. Kafir üstünə gedən Qazan xan, ilk növbədə, ondan anasını azad etməsini istəyir.

Dastanda Salur Qazan və Burla xatun, Dirsə xan və onun xatunu, Dəli Domrul və onun xatunu, Bamsı Beyrək və Banuçiçək, Qanturalı və Selcan xanım münasibətlərindəki səmimilik, istilik, doğmalıq xalqımızın minillərlə formalaşmış ailə modelindən qaynaqlanır.

“Öyünərsə, ər öyünsün, aslandır,
Öyünməklik qadınlara böhtandır”
[Kitabi-Dədə Qorqud. Bakı, 2004]

– deyə təvazökarlıq göstərən xanımlar dastanda xalqımızın ailə dəyərlərini parlaq şəkildə nümayiş etdirirlər. Onların bir-birinə: “Bəri gəlgil, başım baxtı, evim taxtı” – deməsi onu göstərir ki, kişi qadınını başının baxtı, yəni alın yazısı, evinin taxtı, yəni ailəsinin dayağı bilir, həmçinin qadın da ərini. Bu isə dolayısı ilə türk ailəsində kişi və qadın bərabərliyini, onun fonunda isə ailənin müqəddəsliyini təsdiqləyir.

Dahi Nizaminin “Xosrov və Şirin” poemasında Məhinbanunun – Səmiranın qardaşı qızı Şirinə verdiyi müdrik məsləhətləri, onunla münasibətlərdə təmkinli davranışı, Şirinin özünü namuslu, təmiz bir qadın kimi aparması, bibisinin ağıllı nəsihətlərini ürəkdən qəbul edərək həyatının son anına qədər ismət və namusunu qoruması, Xosrovu sonsuz məhəbbətlə sevməsinə rəğmən onunla kəbindənkənar münasibətlərə girməməsi, əsərin sonunda Şiruyənin namussuz təklifini qəbul etməkdənsə, şərəfli ölümü üstün tutması xalqımızın ailə dəyərləri haqqında aydın təsəvvür yaradır.

Məhəmməd Füzulinin “Leyli və Məcnun” poemasında Leylinin anasının qızına nəsihəti əslində hər bir azərbaycanlı ananın öz qızına verdiyi öyüd-nəsihətlərdir:

Key şux! Nədir bu göftügulər?
Qılmaq sənə tənə eybculər?
Nəyçün özünə ziyan edirsən?
Yaxşı adını yaman edirsən?
Nəyçün sənə tənə edə bədgu?
Namusuna layiq işmidir bu?
…Təmkini cününə qılma təbdil!

Qızsan, ucuz olma, qədrini bil!
Hər surətə əks kimi baxma!
Hər gördüyünə su kimi axma!
…Ey iki gözüm, yaman olur ar!
Namusumuzu itirmə, zinhar!
[Füzuli M. Bakı, 2005]

Burada yenə də ümummilli liderimizin sözləri yerinə düşür: “Bizim xalqımızda əsrlərdən bəri formalaşmış, gəlmiş adətlər vardır: kiçiyin böyüyə hörməti, böyüyün də kiçiyə qayğısı, övladın valideynlərinə hədsiz hörməti, valideynlərin də öz övladlarına olan qayğısı və məhəbbəti. Bu, bizim xalqımızın mentalitetidir və biz bununla fəxr etməliyik”.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev cənabları isə milli-mənəvi dəyərlər sistemində ailə dəyərlərimizin yerini və əhəmiyyətini belə müəyyənləşdirmişdir: “Biz ümumbəşəri dəyərləri bölüşürük, ancaq bizim üçün əsas dəyərlər Azərbaycanın milli dəyərləridir. Əgər tarixə bu baxımdan də nəzər salsaq görərik ki, xalqımızın yaşaması üçün öz mənliyini, qürurunu qoruması üçün ailə dəyərləri, milli dəyərlər əvəzolunmaz rol oynamışdır. Ölkəmizin inkişafı, müstəqilliyimizin daha da möhkəmləndirilməsi üçün və milli dəyərlərin tam şəkildə bərqərar edilməsi üçün ailə dəyərləri daim yüksəklərdə olmalıdır”.

Milli-mənəvi dəyərlərimiz sırasında qəhrəmanlıq, mərdlik xüsusi yer tutur. “Kitabi-Dədə Qorqud” qəhrəmanlarının kafirlərlə mübarizədə göstərdikləri igidliyin təbliği gənclərin vətənpərvərlik və qəhrəmanlıq ruhunda tərbiyə olunmasına xidmət edir. Qazan xanın qaçanı qovmaması, aman diləyəni bağışlaması, nahaq qan tökmək istəməməsi yüksək mənəvi keyfiyyətlərdir. Eyni mənəvi dəyərlər digər qəhrəmanlıq dastanı olan “Koroğlu” eposunda da parlaq şəkildə öz əksini tapmışdır. “Qəhrəmanlıq, mərdlik estetik kateqoriya olmaqla yanaşı, milli mentalitetimizin tərkib hissəsidir. Bu kateqoriyalar milli mentalitetə daxil olduqlarından varislik prinsipləri əsasında yaşayır, gələcək nəsillərin ruhuna hopur. Onu yaşadan ən başlıca cəhət isə artıq dillər əzbəri olmuş qəhrəmanlıq nəğmələri, dastanları və başqa bədii dəyərlərimizdir. Bu baxımdan “Koroğlu” dastanındakı vətənpərvərlik ruhu ən çətin məqamda belə düşmənin qarşısında mərdliklə dayanmaq və mübarizə aparmaq üçün daha güclüdür. Qəhrəmanlığın yüksək pafosla tərənnümü gənc nəslin tərbiyə olunmasında, Koroğlu ruhunun onlara hopmasında xüsusi rol oynayır” [Füzuli M. Bakı, 2005].

Hoydu, dəlilərim, hoydu,
Yeriyin meydan üstünə!

Havadaki şahin kimi,
Tökülün al qan üstünə!
[Koroğlu. Bakı, 2005]

– deyərək düşmən üstünə gedən xalq qəhrəmanımız Nigar xanımın ardınca gedərkən:

İgid gərək yar sevməyə
Özü tək gedə, tək gedə.
Müxənnət qəddin əyməyə
Özü tək gedə, tək gedə – söyləyir
[Koroğlu. Bakı, 2005].

Beləliklə, dastan boyu qılıncı və sazı, xalqın biləyinin və biliyinin gücünü nümayiş etdirən Koroğlu həm də elin adət-ənənələrini, elin ruhunu yaşadır.

Koroğlu və onun ətrafına toplaşmış dəlilər vətənpərvərlik və igidliklə yanaşı, mərdlik, alicənablıq, dostluqda sədaqət, sözündə möhkəmlik, dürüstlük, hazırcavablıq, ədalət, məhəbbət, nifrət, ağsaqqala, ağbirçəyə ehtiram, qadınlara hörmət və s. kimi keyfiyyətləri ilə də gənc nəsil üçün örnəkdirlər.

Xalqımızın milli-mənəvi dəyərləri arasında namus, qeyrət, mənlik, kişilik anlayışları xüsusi yer tutur və bunlar ədəbiyyatımızda qəhrəmanlığın əsas əlamətləri kimi təbliğ olunur. Bu baxımdan İsmayıl Şıxlının “Dəli Kür” romanının baş qəhrəmanı Cahandar ağa, həmçinin “Namərd gülləsi” əsərində “Kişini kişi öldürər, qardaş, gəda-güda yox” – deyən Niftalı koxa milli mentalitetimizi, mənəvi dəyərlərimizi özündə yaşadan canlı obrazlardır. Fərman Kərimzadənin “Qarlı aşırım”, “Xudafərin körpüsü”, “Çaldıran döyüşü”, “Təbriz gözəli”, Zahid Xəlilin “Sonuncu güllə” (baş qəhrəmanı Əlif Hacıyev), Mustafa Çəmənlinin “Mübariz” (baş qəhrəmanı Mübariz İbrahimov), Elçin Hüseynbəylinin “Firuzə qaşlı xəncər” əsərlərinin qəhrəmanları mərdlik, qeyrət, əzəmət timsalı kimi gənclərimizə əsl nümunədir.

Bu və adları çəkilməyən onlarla bədii əsərlərdə xalqımızın milli-mənəvi sərvətləri öz əksini tapmışdır. Hər bir ədəbiyyat müəllimi şagirdlərinin oxu vərdişlərini inkişaf etdirməklə, onların mütaliəyə həvəsini gücləndirməklə həm ədəbiyyatımızı təbliğ etmiş, həm də bu misilsiz söz xəzinəsində toplanmış milli-mənəvi inciləri onlara

da aşılamış olar. Bu məqsədlə oxu saatları, bədii qiraət gecələri, “Milli-mənəvi dəyərlərimiz şagirdlərin gözü ilə”, “Ədəbiyyatımızda milli dəyərlərimiz”, “Milli-mənəvi dəyərlərimizi qoruyaq!” mövzusunda inşa müsabiqələri, dəyirmi masalar keçirmək məqsədəuyğundur. Ulu öndərimiz Heydər Əliyevin: “Biz çalışmalıyıq ki, gənclərimiz Azərbaycan xalqına xas olan mənəvi, milli ənənələr əsasında tərbiyə edilsinlər” – çağırışına layiqli cavab vermək üçün belə tədbirlərin keçirilməsi zəruridir.

“Milli-mənəvi dəyərlərin pozulması xalqımıza qarşı bağışlanmaz xəyanətdir” –bəyanatı ilə çıxış edən böyük rəhbər: “Biz öz milli-mənəvi dəyərlərimizlə, adət-ənənələrimizlə fəxr edirik” – demişdir. O, müdrik bir el ağsaqqalı kimi yeni nəslə aşağıdakıları tövsiyə edirdi: “Gənclərimiz bizim tariximizə yaxşı bələd olmalı, dilimizi yaxşı bilməlidir. Milli dəyərlərimizi, milli adət və ənənələrimizi, tariximizi yaxşı bilməyən gənc vətənpərvər ola bilməz”.

Azərbaycan Respublikası Konstitusiyasının 40-cı maddəsinin II bəndində də elə bu fikir ehtiva olunmuşdur: “Hər kəs tarixi, mədəni və mənəvi irsə hörmətlə yanaşmalı, ona qayğı göstərməli, tarix və mədəniyyət abidələrini qorumalıdır” [Azərbaycan Respublikasının Konstitusiyası və hüququn əsasları].

Tariximizə, mədəni və mənəvi irsimizə hörmətlə yanaşma, tarixi və mədəniyyət abidələrini qoruma kimi xüsusiyyətlər də şagirdlərə aşılanmalıdır. Bu istiqamətdə də əsas yük tarix, Azərbaycan dili və ədəbiyyat müəllimlərinin üzərinə düşür. Məktəblərdə kiçik tarix-diyarşünaslıq muzeylərinin yaradılması, bu işə bütün kollektivin, xüsusilə şagirdlərin cəlb olunması, muzeydə məktəblilərdən ibarət bələdçi qruplarının yaradılması, muzey eksponatlarının kataloqlarının hazırlanması, bu kataloqlarda eksponatlar haqqında dəyərli məlumatların əks edilməsi, muzeylərdə əlamətdar və tarixi günlərin təşkili şagirdlərin tarixə olan marağını, soykökümüzə bağlılığını artırar.

“Xalqımızın mədəni irsi bəşər mədəniyyətinin ayrılmaz tərkib hissəsi olduğundan çoxəsrlik tarixi keçmişindən yadigar qalmış tarix və mədəniyyət abidələrinə doğma münasibət öncə vətənə məhəbbətin təcəssümüdür. Məhz buna görə də vətənimizin keçmişinin şahidi olan tarixi abidələrə hörmət bəsləmək, xalqımızın tarixində milli qürur hissi yaradan, mərdlik simvoluna çevrilən

tarixi qalaların əhəmiyyətini dərk etmək, tarixi qəhrəmanların döyüş yolunu öyrənmək, onların vətən haqqında ibrətamiz kəlamlarını qavrayıb dərk etmək insanda vətənpərvərlik hissinin dərin iz buraxmasında müstəsna rol oynayır” [8, s.85].

Şirvanşahlar Saray Kompleksinə, Qız qalasına, Yanardağa, Atəşgaha, Mərdəkan qalasına, “Qala” Dövlət Tarix-Etnoqrafiya Qoruğuna, Qobustan Dövlət Tarixi-bədii Qoruğuna, Azərbaycan Milli Xalça Muzeyinə, Heydər Əliyev Mərkəzinə, müxtəlif rəsm qalereya və sərgilərinə ekskursiyaların, gəzintilərin təşkili şagirdlərin milli-mənəvi dəyərlərimizlə daha yaxından tanış olmalarına, tariximiz, milli köklərimiz, milli-mənəvi sərvətlərimizlə qürur duymalarına vəsilə olar.

Milli-mənəvi dəyərlərimizdən olan adət-ənənələrimiz uzun əsrlər boyu xalqımızın milli ruhunu, estetik duyumunu, sənətkarlıq qüdrətini özündə hifz edib saxlamışdır. Toy və yas mərasimləri, milli bayramımız olan Novruzla bağlı müxtəlif adətlər xalqımızın yüksək mənəvi keyfiyyətlərindən, bədii təxəyyülündən xəbər verir. Novruz bayramı ərəfəsində böyükləri, eləcə də elin ağsaqqal və ağbirçəklərini ziyarət etmək, küsülüləri barışdırmaq, imkansızlara əl tutmaq, bayram sovqatı vermək xalqımızın yüksək milli-mənəvi məziyyətlərindəndir.

Xalqımıza xas olan adət-ənənələri yaşatmağı və təbliğ etməyi tövsiyə edən ümummilli lider Heydər Əliyevin bu istiqamətdə müəyyənləşdirdiyi siyasəti hazırda Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev uğurla davam etdirir.

Möhtərəm prezidentimiz Azərbaycanın milli-mənəvi dəyərlərinə, adət və ənənələrinə xüsusi diqqət yetirərək demişdir: “Azərbaycan xalqı daim öz milli köklərinə, adət və ənənələrinə bağlı olmuşdur və bizim gələcək uğurlarımız da məhz bu amillərlə bağlıdır. Biz tarixi irsimizin, zəngin mədəni irsimizin əsasında müasir, güclü Azərbaycan qururuq”.

**Nəticə / Conclusion**

Xalq şairi Bəxtiyar Vahabzadənin misraları səslənir qulağımda:

Biz tarixə sığınmadıq,
Dünən vardıq, bu gün varıq.
Biz keçmişə güvənərək
Gələcəyə addımlarıq.

Beləliklə, keçmişə güvənərək gələcəyə addımlayan xalqımız möhtərəm prezidentimiz İlham Əliyevin rəhbərliyi altında öz milli-mənəvi sərvətlərinə sahib çıxır, onları öyrənir, təbliğ edir. Azərbaycan Respublikası Prezidentinin 10 oktyabr 2017-ci il tarixli Fərmanı ilə Mənəvi Dəyərlərin Təbliği Fondunun yaradılması məhz bu gözəl arzuya, bu böyük məqsədə xidmət edir.

Ölkəmizdə adət-ənənələr mədəni tədbirlər üçün rəmzi məna kəsb edir və onlara milli məzmun gətirir. Məsələn, Novruz bayramı tədbirlərinin qədim Qoşa qala qapılarının qarşısında keçirilməsi, bu zaman səmənidən, qədim milli geyimlərdən və digər milli-rəmzi atributlardan geniş istifadə olunması, xalq oyun və tamaşalarının nümayiş etdirilməsi buna misal ola bilər.

Xalqımız qədim adət-ənənələrlə yanaşı, həyatımızda yeni formalarda təcəssüm olunan mədəni sərvətimizi bu gün də yaşadır, inkişaf etdirir.

Nəsənsə, özün ol,
Təzəsən onda.
Sən köhnə olursan yamsılayanda.
Nəsənsə, özün ol!
Kökündən yapış!
Dünənə arxalan,
Bu gündən yapış!
[Vahabzadə B. Bakı, 2004]

Milli-mənəvi irsimizin qorunması və inkişafında, adət-ənənələrimizin təbliğində Azərbaycan Respublikasının Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti, UNESCO və ISESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın müstəsna rolu vardır. Musiqimizin, muğamımızın, incəsənətimizin, bayram adət-ənənələrimizin təbliği istiqamətində ardıcıl iş aparılır. Deməli, hazırda misilsiz sərvət və güc mənbəyimiz olan milli-mənəvi dəyərlərimizin təbliği artıq layihə, proqram deyil, həyat tərzidir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Adət və ənənələr mənəvi əxlaqi dəyərlər kimi. (2000). Bakı, Nərgiz.
2. Azərbaycan Respublikasının Konstitusiyası və hüququn əsasları. (2010). Bakı.
3. Füzuli M. (2005). Əsərləri. Altı cilddə, I cild. Bakı, Şərq-Qərb. 400 s.
4. Hüseynov İ. (2002). Azərbaycan milli adət və ənənələrinin bədii-estetik mahiyyəti (monoqrafiya). Bakı, Mars-Print. 305 s.
5. Kitabi-Dədə Qorqud. (2004). Əsil və sadələşdirilmiş mətnlər. Bakı, “Öndər” nəşriyyatı. 376 s.
6. Koroğlu. (2005). Bakı, “Lider” nəşriyyatı. 552 s.
7. “Milli-mənəvi dəyərlərin pozulması xalqımıza qarşı bağışlanmaz xəyanətdir”. (2001). 13 avqust 2001-ci il Azərbaycan prezidenti Heydər Əliyevin Bəyanatı. Azərbaycan. 14 avqust, s.1.
8. Milli-mənəvi dəyərlərin təbliğində kitabxanaların rolu. (2011). Bakı, 85 s.
9. Vahabzadə B. (2004). Seçilmiş əsərləri. İki cilddə, I cild (şeirlər). Bakı, “Öndər” nəşriyyatı. 328 s.

# MÜƏLLİFLƏRİN NƏZƏRİNƏ

*«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalında dərc ediləcək məqalələr üçün texniki tələblər*

## Məqalələrin məzmunu

Məqalələr aktual mövzulara həsr olunmalı, jurnalın məzmun və üslubuna uyğun akademik tələblərə cavab verməli, «Xülasə» (Abstract), «Giriş» (Introduction) və «Nəticə»dən (Conclusion) ibarət olmalıdır. «Xülasə»də məqalənin əhatə dairəsi təsvir edilməli, «Giriş»də mövzunun aktuallığı əsaslandırılmalı, «Nəticə»də isə elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq, müəllifin gəldiyi elmi qənaət, işin elmi yeniliyi, tətbiqi əhəmiyyəti və s. aydın şəkildə verilməli, təklif və tövsiyələr irəli sürülməlidir.

## Məqalələrin strukturu və tərtib edilmə qaydaları

1) Redaksiyaya təqdim edilən məqalələr Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dövri elmi nəşrlərin qarşısında qoyduğu şərtlər də daxil olmaqla aşağıdakı tələblərə cavab verməlidir:

- ✓ Məqalənin adı, müəllifin adı və soyadı, vəzifəsi, elmi dərəcəsi (əgər varsa), işlədiyi qurumun adı, elektron poçt ünvanı və ölkə adı məqalənin titul səhifəsində yazılmalıdır.
- ✓ «Xülasə» Azərbaycan və ingilis dillərində eyni məzmunda olmaqla, təxminən 70-120 söz həcmində verilərək, tədqiqat işinin əhatə dairəsini təsvir etməlidir.
- ✓ «Açar sözlər» Azərbaycan və ingilis dillərində verilərək 3-5 söz və ya söz birləşməsindən ibarət olmalıdır.

2) Məqalənin mətni Microsoft Word proqramında, A4 (210x297mm) formatda, Times New Roman — 14 şriftində yığılmalı, intervalı – 1,15, həcmi 6-15 səhifə olmalıdır.

3) Məqalənin adı və yarımbaşlıqları yalnız ilk hərfi böyük olmaqla, qalın şriftlə yazılmalıdır. Başlıq və yarımbaşlıqlardan, cədvəl və şəkillərdən (həmçinin tənliklər və düsturlardan) əvvəl və sonra bir sətir ara boşluğu buraxılmalıdır. Səhifələr ardıcıl olaraq aşağı sağ küncdə nömrələnməlidir.

4) Cədvəl və şəkillərin adı olmalı və bu ad cədvəllər üçün cədvəlin

üstündə sol küncdə, şəkillər üçün şəklin altında sol küncdə yerləşdirilərək, ardıcıl nömrələnməlidir.

5) Məqalənin mövzusu ilə bağlı elmi mənbələrə zəruri istinadlar olmalı, sonda verilən «İstifadə edilmiş ədəbiyyat»da istinad olunan ədəbiyyatlar mətnin içində [Kazımov Q. Bakı, 2007] və ya [1, s.52] kimi verilməli, sonda isə əlifba ardıcıllığı ilə nömrələnməlidir. Elmi ədəbiyyata mətndə onlayn istinad olarsa 1 qoyaraq aşağıda internet linki göstərilməlidir. Ədəbiyyat siyahısında verilən hər bir istinad haqqında məlumat tam, dəqiq və orijinalın dilində olmalıdır. İstinad olunan mənbənin biblioqrafik təsviri onun növündən (monoqrafiya, dərslik, elmi məqalə və s.) asılı olaraq verilməlidir. Elmi məqalələrə, simpozium, konfrans və digər nüfuzlu elmi tədbirlərin materiallarına və ya tezislərinə istinad edərkən məqalənin, məruzənin və ya tezisin adı göstərilməlidir. Mətndə istinad olunan bütün mənbələr, səhifə nömrələri ilə birlikdə «İstifadə edilmiş ədəbiyyat» siyahısında aşağıdakı nümunələrdə göstərilən qaydada verilməlidir:

a) *Kitablara istinad:* Kazımov Q. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Təhsil. 496 s.

b) *Jurnallara istinad:* Həsənova S. (2021). Aşıq Ələsgər və ədəbi dilimiz. “Azərbaycan dili və ədəbiyyat tədrisi”, № 4. Bakı, “N print studiya”, s.25-34.

c) *Toplularda məqaləyə istinad* (konfrans, simpozium və digər): “Azərbaycan iqtisadiyyatında keçid dövrünün başa çatması: təhlil və nəticələr. Milli inkişaf modelinin formalaşması problemləri”. (2010). Respublika elmi-praktiki konfransının materialları. Bakı, Şərq-Qərb, s.314-316.

ç) *Dissertasiyalar və avtoreferatlar:* Məmmədov H.B. (2013) Azərbaycan Respublikası müasir beynəlxalq siyasi proseslərin aktoru kimi. Elmlər doktoru dissertasiyasının avtoreferatı. Bakı, Elm. 44 s.

d) *Müəlliflik şəhadətnamələri və patentlər*: Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР Б.И. 1988, № 4, s.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

e) *İnternet səhifələri:* İnternet səhifələrinə istinadlar tam göstərilməlidir. Məsələn: http://www.tall.edu.az

6) Məqalədə son 5-10 ilin elmi məqalələrinə, monoqrafiyalarına və digər etibarlı mənbələrinə üstünlük verilməlidir.

7) Məqalə redaksiyaya 3 formada: ya elektron poçtla (*tall@edu.gov.az*), ya jurnalın saytı (http://*tall.edu.az)* üzərindən, ya da çap formasında müəllifinin özü tərəfindən təqdim edilməlidir. Orijinal nüsxədə müəllif(lər)in imzası vacibdir.

**Məqalələrin qəbul edilməsi və dərci**

Təqdim edilən məqalələr redaksiyada nəzərdən keçirildikdən sonra oxunuş üçün (müəllifin adı gizli saxlanılmaqla) mütəxəssislərə göndərilir. Məqalə jurnalın profilinə uyğun olduğu təqdirdə və tələblərə cavab verərsə, çapa təqdim edilir. Müəllif istəsə, ona məqaləsinin qəbul edilməsi barədə sənəd verilə bilər. Məqalələr növbəlilik prinsipi ilə dərc edilir.

**Müəlliflik hüquqları**

Jurnalda dərc edilən məqalələrdə müəlliflik hüququ qorunur və bu məqalələrin bütün nəşr hüquqları *«Azərbaycan dili və ədəbiyyat tədrisi»* jurnalına aiddir. Jurnalda çap edilmiş məqalələrin eyni ilə digər nəşrlərdə (məqalənin tezis şəklində dərc olunmuş variantı istisnadır) dərcinə yalnız redaksiyanın yazılı icazəsi, sitatların verilməsinə isə mənbə göstərilmək şərti ilə yol verilir. Əvvəllər çap olunmuş və ya çap olunmaq üçün başqa bir dövri nəşrə göndərilmiş əlyazmaların jurnala təqdim edilməsi müəlliflik etikasına ziddir. Yuxarıda göstərilən tələblərə cavab verməyən məqalələr qəbul edilmir. Dərc olunmuş məqaləyə görə müəllifə jurnalın bir nüsxəsinin verilməsi nəzərdə tutulur.

# FOR AUTHORS

*Requirements to the articles submitted for publication in «Teaching of Azerbaijani language and literature»*

## Content of articles

The articles should be devoted actual topics, meet the academic requirements of journal's style and content and consist of "Abstract", "Introduction" and "Conclusion". The "Abstract" should mention the main aspects of the article, the "İntroduction" should contain a thesis that will assert the main argument. In the "Conclusion" the author should reinforce the importance of the main idea, emphasize his scientific contention and appreciate his topic in personally relevant ways, and it is notable to shine the scientific novelty and the benefits of the work and to offer suggestions and recommendations.

## Rules of preparing of articles and scope

1) The articles submitted for the editorial must meet the following requirements, including the conditions set out for the periodical scientific publications presented by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan:

- ✓ Title of the article, author's name, surname, position, academic degree, name and address of the organization where he works, E-mail address should be written on the title page of the article.
- ✓ Abstract (in Azerbaijani and English) should be approximately 70-120 words, with the same content.
- ✓ Keywords (in Azerbaijani and English) should consist of 3-5 words or phrases.

2) The text should be typed in Microsoft Word, A4 (210x297mm), Times New Roman — 14, interval – 1, 15, size 6-15 sheets.

3) The title and subheadings of the article should be written in bold, with only the first letter capitalized. Before and after the headline and subheadings, tables and figures (also equations and formulas), a single line spacing should be added. Pages should be numbered in the lower right corner.

4) The table and pictures must be named, and the name should be

placed in the left hand corner above the table, and pictures name should be placed in the left-hand corner under picture.

5) There should be references to scientific sources related to the topic of the article, as well as the sources noted at the end in “used works” should be mentioned in the text as [Kazimov G. Baku, 2021] or [1, p.52], and finally numbered in alphabetical

order. If there is an online reference in the text, you should put an internet link below and number it from one. The information on each reference in the Literature List must be in full, accurate and the native language. The bibliographic description of the source should be based on its type (monograph, textbook, scientific article, etc.). The name of the article, report or thesis should be cited when referring to scientific articles, materials or theses of symposium, conference or other prestigious scientific events. All sources referenced in the text should be cited in the "Used Works or References" list, along with the page numbers, as specified in the following examples:

a) *References to books:* Kazimov G. (2007). Modern Azerbaijani language. Syntax. Baku, Tahsil. 496 p.

b) *References to journals:* Hasanova S. (2021). Ashug Alasgar and our literary language. "Teaching of Azerbaijani language and literature", № 4. Baku, "N print studio", p.25-34.

c) *Reference to the articles in scientific events:* «End of a transitional period in Azerbaijan economy: analysis and conclusions. Problems of National Development Model Formation" (2010). Materials of the scientific-practical conference of the Republic. Baku, East-West, p.314-316.

d) *Dissertation thesis and abstracts*: Mammadov H.B. (2013) The Republic of Azerbaijan as an actor in contemporary international political processes. Doctoral dissertation abstract, Baku, Science. 44 p.

e) *Copyright and Patents:* Aliev S.G., Jalalov K.Kh. A.S. 163514, USSR // B.I. 1988, No. 4, p.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

f) *Internet pages* (references to web pages should be indicated in full): For example: http://www.tall.edu.az

6) The article should give preference to scientific materials, monographs and other reliable sources for the last 5-10 years.

7) The article must be submitted to the editorial office in 3 forms: by e-mail *(tall@edu.gov.az)*, or through the journal's website *(http://tall.edu.az)*, or in printed form by the author of the article.

The original signature of the author is important.

**Acceptance and publication of articles**

After review, the presented article will be sent to experts to be read out. If the article corresponds to the journal profile and meets the requirements, the printing is provided. If the author wishes, a document on his / her article acceptance may be issued. Articles are published on the principl of rotation.

## Copyright

# К СВЕДЕНИЮ АВТОРОВ

*Технические требования к статьям опубликованным в журнале «Преподавание Азербайджанского языка и литературы»*

## Содержание статей

Статьи должны быть посвящены актуальным темам и соответствовать академическим требованиям в соответствии с содержанием и стилем журнала. Статьи должны состоять из *«Аннотация»* (Abstract), *«Введение»* (Introduction) и «*Заключение»* (Conclusion). В *«Аннотации»* должно указыватсья основные аспекты статьи, в *«Введение»* должно обосновываться актуальность темы, а *«Заключения»* должно основываться на характере области статьи. Важность приложения, научный вывод, сделанный автором, научная новизна работы, экономические выгоды и т. д. должны быть четко указано и должны быть выдвинуты предложение и рекомендации.

## Структура и правила составления статей

1) Статьи, представленные в редакцию, должны соответствовать следующим требованиям, в том числе условиям, установленным Высшей Аттестационной Комиссией при Президенте Азербайджанской Республики, для периодических научных публикаций:
   - ✓ На титульном листе статьи должны быть указаны название статьи, имя и фамилия, должность, ученая степень, название и адрес организации, адрес электронной почты автора.
   - ✓ Ключевые слова (на азербайджанском и английском языке) должны состоять из 3 - 5 слов или фраз.
   - ✓ Резюме (на азербайджанском и английском языке) должна составлять примерно 70-120 слов с одинаковым содержанием.

2) Текст статьи должен написан в программе Microsoft Word, A4 (210x297 мм), Times New Roman — 14, интервал — 1, 15, объем 6-15 страниц.

3) Названия статьи должен писаться с жирным шрифтом с большой буквой. До и после заголовка и подзаголовков, таблиц и рисунков (также уравнений и формул) должен быть выпущен один междустрочный интервал. Страницы должны располагаться последовательно в правом нижнем углу.

4) Таблицы и рисунки должны иметь имя и это имя для таблиц должен перемещаться над таблицей в левом углу, а для рисунков под рисунки в левом углу и последовательно пронумероваться.

5) Необходимые ссылки на научные источники, относящиеся к теме статьи, должны быть приведены в тексте как ссылки на «использованную литературу» в тексте [Казымов Г. Баку, 2021 г.] или [1, с.52] и в конце должны быть упорядочены в алфавитном порядке. Если в тексте есть онлайн-ссылка на научную литературу, интернет-ссылка должна быть показана ниже, поставив 1. Информация по каждой ссылке в списке литературы должна быть полной, точной и на языке оригинала. Библиографическое описание справочного источника следует представить в зависимости от его типа (монография, учебник, научная статья и т). При ссылке на научные статьи, материалы или тезисы симпозиумов, конференций и других престижных научных мероприятий необходимо указывать название статьи, доклада или диссертации. Все источники, на которые есть ссылки в тексте, должны быть включены в список «Использованная литература» вместе с номерами страниц в следующих примерах:

а) *Ссылки на книги:* Казимов Г. (2007). Современный азербайджанский язык. Синтаксис. Баку, Тахсил. 496 с.

б) *Ссылка на журналы:* Гасанова С. (2021). Ашуг Алесгар и наш литературный язык. «Преподавание азербайджанского языка и литературы». № 4, Баку, «N print studio», с.25-34.

в) *Ссылки на статьи в сборнике (конференция, симпозиум и т. д.):* «Конец переходного периода в экономике Азербайджана: анализ и итоги. Проблемы формирования модели национального развития». (2010). Материалы республиканской научно-практической конференции. Баку, Восток-Запад, с.314-316.

г) *Диссертации и авторефераты:* Мамедов Х.Б. (2013) Азербайджанская Республика — современная международная политика как актер в процессе. Автобиография докторской диссертации, Баку, Наука, с.44.

д) *Авторские свидетельства и патенты:* Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР. БИИ 1988, № 4, с.50 Langsam M., Savoca A. C.L. Патент 4759776, США,1988

e) *Ссылки на веб-страницы:* Ссылки на веб-страницы должны быть полностью показаны. Например: http://www.tall.edu.az

6) В статье предпочтение отдается научным статьям, монографиям и другим надежным источникам написанном последние 5-10 лет.

7) Статью можно представить в редакцию в 3-х формах: либо по электронной

почте *(tall@edu.gov.az)*, либо через сайт журнала *(http://tall.edu.az)*, либо в печатном формате автором статьи. В оригинале обязательна подпись автора(ов).

**Прием и публикация статей**

Представленные статьи после ознокомлений в редакции отправляют (после того, как имя автора останется конфиденциальным) экспертам для прочтения. Если статья соответствует профилю журнала и требованиям, тогда предоставляется в печать. По желанию автора может быть выдан документ о его принятии статьи. Статьи публикуются по принципу очереди.

**Авторские права**

Авторские права на статьи, публикуемые в журнале защищены и все права на публикации этих статей принадлежит журналу *«Преподавание Азербайджанского языка и литературы».* Статьи, опубликованные в журнале, допускаются только с письменного разрешения редакции для других опубликованных публикаций (кроме статьи, опубликованной как тезис). А для использования цитатов можно только с одним условиям показать источника. Рукописи, отправленные для печати в другое периодическое издание или в раннем времени напечатанные в другом журнале подача в редакцию, противоречит этику авторов. Статьи, не соответствующие вышеуказанным требованиям, не принимаются. Для опубликования статьей предназначен представить автору одну копию журнала.

